ZƏRİFƏ RZAQULU QIZI QULİYEVA

# Heydər Əliyev irsi.
# Qarabağ Azərbaycandır!

*Unudulmaz Ulu öndər, Heydər Əliyevin*
*100 illik yubileyinə ithaf olunur.*

Bakı 2023

**ZƏRİFƏ RZAQULU QIZI QULİYEVA**

**Heydər Əliyev irsi. Qarabağ Azərbaycandır!**

**Bakı - Red N Line MMC - 2023, 160 səh.**

**Məsləhətçi: Professor Rəna SeyidRza qızı Mirzəzadə**

**Kitab Azərbaycanın Ümummilli lider, Azərbaycan dövlətçilik institutunun görkəmli siyasi xadimi Heydər Əliyevin müstəqil respublikanın suverenliyi, çoxistiqamətli inkişaf strategiyası və bu kontekstdə də Prezident İlham Əliyevin müsahibə və çıxışlarına istinadən araşdırılan hadisə və proseslərin şərhindən ibarət məqalələr toplusudur.**

**Kitab vətəndaş cəmiyyəti üzvləri, siyasət nümayəndələri, tədqiqatçı və tələbələr, həmçinin geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.**

**Kitab YAP Veteranlar Şurasının üzvü, "Modern Inkişaf və ailə" İctimai Birliyinin sədri, AMEA Qadınlar Şurası İdarə Heyətinin üzvü, Prezident İlham Əliyev tərəfindən "Tərəqqi" medalı ilə təltif olunmuş Zərifə Rzaqulu qızının müxtəlif sayt, qəzet və jurnallarda dərc edilmiş məqalələr və müsahibələri toplusundan ibarətdir.**

**İSBN: 978 9952 485 21 9**



**Azərbaycan mənim həyatımdır!**

*Ulu öndər Heydər Əliyev*



**Qarabağ Azərbaycandır, nida!**

*Prezident İlham Əliyev*

## Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev İli" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

2023-cü il mayın 10-da Azərbaycan xalqının Ümummilli Lideri, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasi və dövlət xadimi **Heydər Əliyevin** anadan olmasının 100 ili tamam olur.

**Heydər Əliyev** öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz **Heydər Əliyev** zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan Heydər Əliyevin həyat amalının təntənəsidir.

Azərbaycana rəhbərliyinin birinci dövründə **Heydər Əliyev** özünün qeyri-adi idarəçilik bacarığı, polad iradəsi və yüksək vətənpərvərliyi sayəsində, uzaqgörən və məqsədyönlü qərarları ilə çox qısa müddətdə respublikamızda sosial-iqtisadi, elmi-texniki və mədəni sahələrin inkişafında böyük sıçrayışa nail olmuşdur. Tariximizin gedişatının və həyatımızın ahənginin köklü surətdə dəyişdiyi, azadlıq və müstəqillik duyğularının milli düşüncəmizdə üstünlük təşkil etməyə başladığı bu illər Azərbaycanın quruculuq salnaməsinin ən parlaq səhifələridir. **Ulu öndərin** xalqın yaradıcılıq enerjisini bir məqsədə yönəltməklə tarixi yaddaşın bərpası istiqamətində atdığı qətiyyətli addımlar o dövrdə milli ruhun canlanmasına xidmət göstərmiş, özünüdərki və soy-kökə qayıdışı təmin etmiş, müstəqil dövlət quruculuğuna aparan yolun təməl daşına çevrilmişdir.

Böyük siyasi iradəyə, sarsılmaz əqidəyə malik olan Heydər Əliyevin tükənməz dövlət idarəçiliyi istedadı onun SSRİ-nin rəhbərlərindən biri kimi çalışdığı və irimiqyaslı layihələr həyata keçirdiyi illərdə özünü bir daha parlaq surətdə təzahür etdirmişdir. Heydər Əliyev bütün varlığı ilə sevdiyi və canından əziz bildiyi doğma xalqının mənafelərini daim önə çəkmiş və respublikamızın inkişafı üçün malik olduğu bütün imkanlardan istifadə etmişdir.

Zamanın hökmü ilə ötən əsrin 90-cı illərində dövlət müstəqilliyini bərpa edən Azərbaycan Ermənistanın təcavüzü, xarici təzyiqlər və

daxili çəkişmələr üzündən dünyanın siyasi xəritəsindən silinmək və dövlətçiliyini itirmək təhlükəsi ilə qarşılaşmışdır. Taleyimizin həll olunduğu ağır bir zamanda xalqın təkidli tələbinə səs verərək yenidən hakimiyyətə qayıdan **Heydər Əliyev** doğma Vətənin xilası naminə misilsiz fədakarlıq nümayiş etdirmiş, ölkəmizi ictimai-siyasi pərakəndəliyin və anarxiyanın məngənəsindən qurtarmış, bütün sahələrdə müşahidə olunan dərin tənəzzülün qarşısını almış, yenidən qurduğu və hər cür qəsdlərdən qoruduğu dövlətin dayanıqlı inkişaf yolunu müəyyən etmişdir. **Heydər Əliyevin** ölkəmizə rəhbərliyi illəri xalqımızın nadir tarixi imkandan faydalanaraq, böyük əziyyətlər bahasına öz müstəqilliyini əbədi və dönməz etdiyi taleyüklü mərhələdir.

**Heydər Əliyevin** zəngin həyat yolu və müstəsna fəaliyyətinin bütün mərhələləri bir-birini tamamlamış, öz xalqına sıx bağlılığın, milli dövlətçilik məfkurəsinə sadiqliyin canlı təcəssümü olmuşdur. Geniş bilik və dərin təfəkkür sahibi olan Heydər Əliyev düşünülmüş və cəsarətli qərarları ilə təkcə müstəqillik dövründə deyil, bütün dövrlərdə Azərbaycan ictimaiyyətini ən ciddi şəkildə düşündürən məsələləri uğurla həll etmişdir. Ulu öndər cəmiyyət həyatının müxtəlif sahələri arasında üzvi bağlılığı aydın görərək, müəllifi olduğu milli inkişaf strategiyasında ictimai, siyasi, sosial, iqtisadi, mədəni və digər sahələrdə qarşıda duran vəzifələri düzgün müəyyənləşdirmiş və məharətlə həyata keçirmişdir. **Heydər Əliyevin** milli neft strategiyasının uğurla reallaşdırılması nəticəsində xalqımız öz təbii sərvətlərinin tam sahibinə çevrilmiş və qısa müddətdə ölkəmizin inkişafına güclü təkan verən resurslar əldə edilmişdir. Azərbaycan Respublikasının ilk Konstitusiyasının qəbul olunması və bütün sferaları əhatə edən köklü islahatların həyata keçirilməsi, demokratik, hüquqi dövlət quruculuğu, nizami ordunun yaradılması **Heydər Əliyevin** Azərbaycan xalqı qarşısında müstəsna xidmətləridir. Xalqımızı vahid amal ətrafında birləşdirən azərbaycançılıq ideologiyasının formalaşdırılması, ana dilinin dövlət qayğısı ilə əhatə olunması, ictimai-siyasi, elmi və mədəni fikir tariximizin əlamətdar hadisələrinin müntəzəm qeyd edilməsi ənənəsinin yaradılması, Azərbaycanın çoxəsrlik mənəvi-mədəni irsə sahib qədim diyar və sivilizasiyaların qovşağında yerləşən tolerantlıq məkanı kimi geniş şöhrət qazanması **Heydər Əliyevin** mükəmməl quruculuq proqramının tərkib hissələri olmuşdur.

Dövrünün ən nüfuzlu siyasətçiləri ilə bir sırada duran **Heydər Əliyev** Azərbaycanın müasir simasının, xalqımızın zəngin dəyərlərinin tanıdılması və ölkəmizin beynəlxalq münasibətlər sistemində layiqli mövqe qazanmasında müstəsna rol oynamışdır. Ermənistan–Azərbaycan münaqişəsinin beynəlxalq hüququn norma və prinsipləri əsasında həlli **Ulu öndərin** qarşıya qoyduğu başlıca vəzifə olmuş, ölkəmizin bütün resursları, xalqımızın potensialı tarixi ədalətin bərpası üçün səfərbər edilmişdir. **Ulu öndərin** şah əsəri olan güclü Azərbaycan dövləti öz suverenliyini, müstəqilliyini qorumağa qadir olduğunu 44 günlük Vətən müharibəsində şanlı Zəfər qazanmaqla sübuta yetirmişdir.

Dövlətçilik salnaməmizdə silinməz izlər qoymuş, azərbaycanlı olması ilə ömür boyu fəxr etmiş, milli qürur və iftixar mənbəyimiz olan **Heydər Əliyev** bütün dünyada Azərbaycanın rəmzi kimi qəbul edilir. Xalqımız onun əziz xatirəsini həmişə uca tutur və minnətdarlıqla anır, yenidən hakimiyyətə gəldiyi günü Azərbaycan Respublikasının dövlət bayramı – Milli Qurtuluş Günü kimi qeyd edir.

Müstəqil Azərbaycan **Ulu öndərin** indiki və gələcək nəsillərə əmanəti, onun zəngin və çoxşaxəli irsi isə xalqımızın milli sərvətidir. Bu müqəddəs mirası qoruyub saxlamaq hər bir azərbaycanlının şərəfli vəzifəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan xalqının Ümummilli Lideri **Heydər Əliyevin** 100 illik yubileyinin dövlət səviyyəsində qeyd olunmasını təmin etmək məqsədilə qərara alıram:

1. Azərbaycan Respublikasında 2023-cü il "**Heydər Əliyev** İli" elan edilsin.

2. Azərbaycan Respublikası **Prezident**inin Administrasiyası Azərbaycan Respublikasında 2023-cü ilin "**Heydər Əliyev** İli" elan edilməsi ilə bağlı tədbirlər planına dair təkliflərini iki ay müddətində hazırlayıb Azərbaycan Respublikasının **Prezident**inə təqdim etsin.

**İlham Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**
**Bakı şəhəri, 29 sentyabr 2022-ci il**

## I fəsil
## HEYDƏR ƏLİYEV DÜHASININ UĞUR TƏNTƏNƏSİ

**Ulu öndər** müəyyənləşdirdiyi siyasət daim ölkəmizə və xalqımıza işıqlı yol göstərir və zaman ötdükcə Onun Azərbaycanın inkişafı naminə gördüyü işlərin miqyası daha dərindən dərk olunur.

**Ulu öndər Heydər Əliyevin** Azərbaycana Rəhbərlik etdiyi həm sovet, həm də müstəqillik dövrü tarixi ölkəmizin inkişaf mərhələsidir.

Fenomen, uzaqgörən dühası ilə məntiqi parallellik vəhdətində Azərbaycanı gerilikdən tərəqqiyə çıxaran lider- **Heydər Əliyev** idi.

Təəssüf amansız həyat Böyük Şəxsiyyətin də haqqında "idi" keçmiş zamanda yazıb, danışmağa vadar edir,

Misli görünməyən xidmətləri ilə Azərbaycan Dövlətçilik tarixinin Böyük Şəxsiyyəti- **Heydər Əliyev** idi.

Fikirləri, kəlamları, deyimləri bir məsələ çevrilən, siyasəti məktəb olan, fəaliyyəti örnək kimi öyrənilən **Heydər Əliyev** idi. Bu isə "**Heydər Əliyev** məktəbi" adlanır. Varlığı qədər Vətənə bağlı, milli dəyərlərə üstünlük verən və qoruyan Rəhbər - **Heydər Əliyev** idi. Böyük olduğu qədər sadə, yüksək olduğu qədər adi, "Azərbaycan mənim canımdır" bəyan edən milli təfəkkürlü, milli kimlikli, milli məntiqli Lider **Heydər Əliyev** idi və söyləyirdi ki: **"Mənim həyatımın məqsədi Azərbaycandır, Azərbaycan xalqıdır, Azərbaycan Respublikası, Azərbaycan vətəndaşıdır."**

2023-cü ildə Azərbaycan xalqı böyük sevinc və qürurla müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasətçi və dövlət xadimi ümummilli lider **Heydər Əliyevin** 100 iiliyini qeyd edir. Bu yubiley daha yaddaqalan fərqli bir tarixdir. **Prezident** İlham Əliyevin 29 sentyabr 2022-ci il tarixində "Azərbaycan Respublikasında 2023-cü ilin «**Heydər Əliyev** İli» elan edilməsi haqqında» imzaladığı Sərəncam bir daha xalqımızın öz liderinə olan məhəbbətinin təzahürüdür. Sərncamda deyilir: «**Heydər Əliyev** öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz **Heydər Əliyev** zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan Heydər Əliyevin həyat amalının təntənəsidir".



## AZƏRBAYCANIN KEÇMİŞ SOVET DÖVRÜ TARİXİNDƏ DÖNÜŞ İLİ - 1969-CU İL

Bir tarixi gerçəklikdir ki, **Heydər Əliyev** dühasının mənalı ömür yolunun hər anı, hər səhifəsi bugünkü və gələcək nəsillərə nümunə olacaq canlı və unudulmaz salnamədir.

Hakimiyyətdə olduğu həm keçmiş sovet dövrü, həm də müstəqillik zamanı **Ulu öndər** xalqının tarixi mənafeyi uğrunda əzmlə mübarizə aparmış, ictimai-siyasi proseslərdə daim özünü qurucu milli vətənpərvər olaraq təsdiq etmişdir. 1969-cu il iyuldan **Heydər Əliyevin** sovet Azərbaycanına rəhbərliyə başlaması, Azərbaycanın isə onun simasında özünə yeni fəaliyyət metodlarına malik rəhbər tapması hər ikisinin yüksəlişinin, xalqın da rifahının başlanğıcı oldu!

Azərbaycana rəhbərliyə başladığı gündən hər bir vətəndaş, bütövlükdə xalq ona arxa duran, mənafeyini qoruyub müdafiə edən, haqsızlıq və qanunsuzluqla barışmayan güclü liderin hakimiyyətə gəldiyini düşünürdü. Hakimiyyətə gəldiyi ilk günlərdən **Heydər Əliyevin** rəhbərliyi altında respublikada həyata keçirilən genişmiqyaslı islahatlar iqtisadi potensialın formalaşdırılmasına, sosial-mədəni

həyatın canlandırılmasına və milli-mənəvi dəyərlərin dirçəldilməsinə yönəldilərək gələcək müstəqilliyin təmin olunması üçün zəmin hazırladı.

**Ulu öndər Heydər Əliyev** sovet Azərbaycanına rəhbərlik etdiyi dövrləri xatırlayarkən deyirdi: **«Biz sovet rejimində yaşayırdıq. Məgər biz bu rejimi dəyişə bilərdik? Amma iş ondadır ki, bu rejim altında olsa da, sən xalqın, millətin üçün nə edirsən. Əgər bu rejimi dəyişdirə bilmirsənsə, onda onun imkanlarından istifadə edib xalqına kömək göstər. Mən bunu etdim. Azərbaycan o illərdə çox yüksəklərə qalxdı».**

Azərbaycan sosial-iqtisadi vəziyyətinə görə keçmiş SSRİ-nin tərkibində olan 15 respublika sırasında sonuncu yerlərdə qərarlaşırdı. Bütün göstəricilər üzrə belə idi. Amma **Heydər Əliyev** 1969-cu ildə hakimiyyətə gəldikdən sonra ilk 5 illikdə inkişaf baş verdi. Belə ki, 1970-1982-ci illərdə respublikada 250 yeni müəssisə, istehsalat və sex tikilmiş, neftayırma sənayesi müəssisələri tamamilə yenidən qurulmuş, iri elektron, elektrotexnika, radiotexnika, cihazqayırma sənayesi zavodları inşa olunmuşdur. Nəticədə, göstərilən müddətdə Azərbaycanda sənaye istehsalı 2,7 dəfə artmışdır.

1970-1982-ci illərdə kənd təsərrüfatının məcmu məhsulu 2,6 dəfə çoxalmış, əmək məhsuldarlığı 2,2 dəfə yüksəlmişdir. Əsaslı dövlət vəsaiti qoyuluşunun 1 manat artımı hesabına əlavə olaraq 3,5 manatlıq məhsul alınmışdır. Göstərilən dövrdə milli gəlir 2,6 dəfə çoxalmışdır. Azərbaycan büsbütün yenidən tikilib qurulmuş, kənd və qəsəbələr salınmış, fabrik və zavodlar tikilmiş, yaşayış məntəqələrinin siması tamamilə dəyişmişdir.

XX əsrin yetmişinci illərinədək Azərbaycan kəndi əsasən çiy kərpicdən və palçıqdan tikilmiş komalardan ibarət idi. Kəndlinin gəliri az olduğundan güzəranı ağır keçirdi. Kənd təsərrüfatının yüksəlişi bu sahədə inqilabi dəyişiklik yaratdı. Yeni texnika və aqrotexniki qaydaların genişmiqyaslı tətbiqi hesabına əmək məhsuldarlığı və məhsul istehsalı bir neçə dəfə artdı, təsərrüfatların və əməkçilərin gəliri qat-qat çoxaldı. Kəndlinin güzəranı və məişət şəraiti dəyişdi. Azərbaycan kəndi palçıq komalardan qurtularaq simasını dəyişdi. O vaxtdan həyatində minik avtomobili, ikimərtəbəli ağ mişar daşından evi, məişətində hər növ elektrik cihazları olan kəndli ailələri Azərbaycan kəndlisini xarakterizə edən başlıca əlamətə çevrildi. Bu gün elə bir kənd tapılmaz ki, orada

**Heydər Əliyev** dövrünü xatırladan bir neçə «abidə»yə rast gəlinməsin.

Ölkə paytaxtı Bakı şəhəri də yeni mikrorayonlar, park və xiyabanlar, küçə və meydanlar hesabına böyüyərək gözəlləşdi. «Gülüstan» və «Respublika» sarayları, Prezident sarayı və Milli Məclisin binası, «Moskva», «Azərbaycan», «Abşeron» mehmanxanaları, Əl oyunları sarayı və Olimpiya İdman Kompleksi, metro stansiyaları və digərləri həmin dövrdə tikilmiş, N.Nərimanova, C.Cabbarlıya, Nəsimiyə, Hüseyn Cavidə və digər görkəmli həmvətənlərimizə abidələr qoyulmuş, onlarla ədəbiyyat və incəsənət xadiminə, sənətkara fəxri adlar, dövlət mükafatları verilmişdir.

**Ulu öndər Heydər Əliyev** bütün sahələrdə olduğu kimi hərbi quruculuq sahəsində, ordu sıralarında da milli kadrların yetişməsinə və yerləşməsinə çalışırdı. **Ulu öndər** vurğulayırdi ki: **"Ordu daim dövlət qayğısı altında olmalıdır, xalqın qayğısı ilə əhatələnməlidir."** Ölkəyə birinci rəhbərliyi dövründə Azərbaycanda fəaliyyət göstərən hərbi məktəblərlə maraqlanan ümummilli lider orada nəinki təhsil alanların, hətta dərs deyənlərin sırasında belə azərbaycanlıların tək-tük olduğunu bilmişdi. Çox keçmədən **Ulu öndərin** təşəbbüsü və şəxsi himayəsi altında Cəmşid Naxçıvanski adına hərbi təmayüllü məktəb açıldı. Tezliklə bu məktəb böyük şöhrət qazandı. Yeniyetmələr həvəslə burada oxumağa gəlir, sonra təhsillərini keçmiş SSRİ-nin müxtəlif ali hərbi məktəblərində uğurla davam etdirirdilər. Qarabağ uğrunda döyüşlərdə məktəbin müdavimləri böyük şücaət göstərdi, bir çoxu Azərbaycanın Milli Qəhrəmanı fəxri adına layiq görüldü. Müstəqillik dövründə milli ordu quruculuğunda vaxtilə C.Naxçıvanski adına hərbi təmayüllü məktəbi bitirən zabitlərin əməyi böyük olmuşdur. Onlar bu gün də orduda ləyaqətlə xidmət edir, **Heydər Əliyev** ideyalarına sadiqliklərini nümayiş etdirirlər.

## HEYDƏR ƏLİYEV VƏ YENİ AZƏRBAYCAN PARTİYASI

Müstəqil Azərbaycanda demokratiyanın təməli çoxpartiyalılıq sistemi, siyasi proseslərdə iştirakdır. YAP-ın yaradılması **Ulu öndər Heydər Əliyev**ə Azərbaycan cəmiyyətinin sifarişi idi, çünki ölkədə yeni siyasi partiya yaradılması Azərbaycanın gələcəyi və Azərbaycanın çox ciddi siyasi-iqtisadi kataklizmlərdən çıxış yolu idi. Məşhur "91-lər"in müraciəti əsasında ümummilli lider **Heydər Əliyev** Yeni Azərbaycan Partiyasının yaradılmasına, ona rəhbərlik etməyə razılıq verdi. Nəticədə, **Ulu öndər Heydər Əliyevin** rəhbərlik etdiyi Azərbaycanın siyasi sisteminin əsas rolu olan Yeni Azərbaycan Partiyası yaradıldı. Naxçıvandan başlayaraq bütün Azərbaycanın yenilənməsinə gedən yolun əsası qoyuldu. 1992-ci il noyabrın 21-də bir müxalifət partiyası olaraq yaranan Yeni Azərbaycan Partiyası hakimiyyətə sivil yolla gəlməyin əsl "yol xəritəsi"ni ortaya qoydu. **Ulu öndər Heydər Əliyevin** rəhbərliyi ilə yaranan partiya **Ulu öndərin** dediyi kimi: **"Dünənin, bu günün və gələcəyin partiyasıdır".**

YAP cəmiyyətdə böyük nüfuza malik, regionda ən böyük siyasi təsisatdır. Partiyanın proqramında irəli sürülmüş əsas vəzifələr - dövlət müstəqilliyinin möhkəmləndirilməsi, demokratik, hüquqi, dünyəvi dövlətin qurulması, vətəndaşların dinc və firavan həyatının təmin edilməsi xalqı tam qane edir. Partiya məfkurəsinin əsasını təşkil edən müstəqil dövlətçilik, qanunçuluq, azərbaycançılıq, yaradıcı təkamül, vətəndaş həmrəyliyi və sosial ədalət prinsipləri YAP-ın qarşısında duran vəzifələrin həyata keçirilməsinin ideya təminatı olaraq mahiyyətcə Azərbaycanın siyasi gələcəyinin ideya bazasına çevrilmişdir. **Ulu öndər** vurğulamışdır ki; **"Mən Yeni Azərbaycan Partiyası ilə bərabərəm... Hesab edirəm ki, YAP yaşayacaq və fəaliyyət göstərəcəkdir"** Bütün bunların fonunda YAP-ın ölkənin siyasi sistemində aparıcı təşkilata çevrildiyi, onun malik olduğu potensialın respublikanın problemlərinin həllində mühüm faktorlardan biri kimi çıxış etdiyi təkzibolunmaz həqiqətdir.

YAP-a XXI əsrin əvvəlindən **Prezident** İlham Əliyev kimi güclü siyasi Liderin rəhbərlik etməsi partiyanın nəinki daxildə, eləcə də respublikamızdan kənarda güclü və nüfuzlu siyasi qüvvə kimi qəbul olunmasını təmin edir və YAP-ın siyasi fəaliyyətinin ictimai



rəydə doğurduğu müsbət reaksiya, onun cəmiyyətə təqdim etdiyi ideologiyanın cəlbediciliyində özünü göstərir. Partiyanın qarşıya qoyduğu məqsədlər bütün dövrlərdə zamanla səsləşdiyindən, ictimaiyyətin böyük diqqətinə, marağına səbəb olur. Çətin və şərəfli yol keçən qələbələr partiyası olan Yeni Azərbaycan Partiyası öz sıralarında müxtəlif təbəqədən çox insanı birləşdirir. Azərbaycanın müstəqillik tarixində qazandığı hər bir uğurunda Yeni Azərbaycan Partiyasının öz dəst-xətti, rolu vardır. Yeni Azərbaycan Partiyası təmsilçiləri **Heydər Əliyevin** siyasi kursunu uğurla davam etdirir. Yeni Azərbaycan Partiyası şərəfli yol keçərək monolitliyini qorudu, gücləndi, öz üstünlüyü, parlaq qələbələri ilə hər bir seçkidə qələbə qazandı. Yeni Azərbaycan Partiyasının seçkilərdə qazandığı qələbələr bu partiyanın cəmiyyətdəki yerinin möhkəmliyini, dövlətçiliyimizin gücləndirilməsi istiqamətində həyata keçirilən siyasətə xalq dəstəyini, insanların bu təşkilata yüksək etimadını göstərir. Bütün iştirak etdiyi seçkilərdə Yeni Azərbaycan Partiyası qələbə qazanaraq bir daha ölkə vətəndaşlarının Azərbaycan reallığına verdiyi qiymətin əksidir. **Ulu öndər Heydər Əliyevin** ideyaları yaşayır, qalib gəlir.

Azərbaycan **Prezidenti**, **Ali Baş Komandan**, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyev tərəfindən bu ölməz amallar sədaqətlə,

cəsarətlə daha müvəffəqiyyətlə həyata keçirilir.

Azərbaycan **Prezident**i, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyev martın 5-də partiyanın VII qurultayında çıxışı zamanı bir çox məsələlər toxunaraq **"Partiyamızın VII qurultayı ölkəmizin ictimai-siyasi həyatında önəmli hadisə olduğunu bildirmişdir."** Azərbaycan **Prezident**i İlham Əliyev Yeni Azərbaycan Partiyasının VI qurultayından üç il ötdüyünü və bu illər ərzində böyük nailiyyətlər və qələbələr əldə olunduğunu deyib: **"Bu illər ölkəmiz üçün, bölgəmiz üçün həlledici illər olmuşdur. Üç il ərzində ölkə həyatında bir çox önəmli hadisələr baş vermişdir. Təbii ki, onların arasında ən önəmlisi ərazi bütövlüyümüzün bərpa edilməsi, Vətən müharibəsində parlaq Qələbənin qazanılmasıdır. Azərbaycan öz ərazi bütövlüyünü bərpa etdi, tarixi ədaləti bərpa etdi, işğalçıları əzəli torpaqlarımızdan qovdu və beləliklə, tarixi ədalət bərpa olundu. Bizim şanlı Qələbəmiz qürur mənbəyimizdir".**

Qələbə qazanmaq həqiqətən də qürur mənbəyidir. Bu reallığı Azərbaycan xalqı görür və bəlkə də bu son 30 ildə bu qədər qürurlu olmamışdı - 44 gün ərzində tarixin Zəfər Salnaməsi yazıldı, Bütövləşən Azərbaycan – Qarabağ Azərbaycana qovuşdu. Məhz bu Böyük Qələbə **Prezident** İlham Əliyevin sözünə, vədinə sadiq qalan dövlət başçısı imicini qazanması bütün sahələrdə təsdiqlənməsinin reallığıdır. Bu yerdə **Prezident** İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində söylədiyi bu fikirləri bir daha yada salmaq yerinə düşər: **"Bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün, ən başlıcası, ölkədə Ümummilli Lider Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən, mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm".**



## HEYDƏR ƏLİYEV DÜHASI VƏ İDEYALARI

**İnkişaf və yenidənqurma: Azərbaycan milli tarixinin dönüş anı**

Belə bir deyim var - tarix ən ədalətli hakimdir. Bu gün yaxın tariximizə diqqətlə nəzər yetirdikdə bugünkü inkişafımız və sabitliyin haradan başlandığını yaxşı anlayırıq. Xalqın tarixində liderin rolu, yeri və belə şəxsiyyətin siyasət meydanına çıxması isə böyük tarixi hadisə kimi daim yaddaşlarda yaşayır. Məhz 1969-cu il iyulun 14-ü ən yeni tariximizin belə şərəfli, müqəddəs səhifələrindəndir. **Prezident** İlham Əliyevin söylədiyi kimi: **"Cəmiyyətin ictimai-siyasi quruluşundan asılı olmayaraq, Heydər Əliyev bütün dövrlərdə xalqın dəstəyini hiss edərək Azərbaycanı inamla irəliyə aparırdı. Sovet dönəmində və müstəqillik dövründə Azərbaycan üçün, xalqımız üçün ən həlledici anlarda Heydər Əliyevin liderlik keyfiyyətləri, onun müdrikliyi, düşünülmüş siyasəti və cəsarətli addımları xalqımızı böyük bəlalardan xilas etmişdir. Xalq ona inanırdı, onu sevirdi və bütün dövrlərdə ona arxa-dayaq olmuşdur"**. Dövlət başçımızın dediyi kimi: "Xalq ona inanırdı, onu sevirdi və bütün dövrlərdə ona arxa-dayaq olmuşdur". Müasir Azərbaycanın taleyini müəyyənləşdirən, xalqın yaddaşına həmişəlik həkk olunan – 14 iyul 1969-cu il - Böyük Yolun başlanğıcı dövrü, Azərbaycan milli tarixinin dönüşüdür. İnkişafa səmtlənən siyasət və yenidənqurma zamanı idi. Məhz həmin gün müstəqil dövlətimizin qurucusu, **Ulu öndər**

**Heydər Əliyev** ilk dəfə respublika rəhbəri seçilib.

Ümummilli Lider **Heydər Əliyevin** timsalında bu fikri də böyük əminliklə qeyd edirik ki, tarixdə elə şəxsiyyətlər olur ki, onların həyat və fəaliyyətindən bəhs etmək üçün bütöv bir xalqın, dövlətin tarixini vərəqləmək gərəkdir. **Ulu öndər Heydər Əliyev** məhz belə xoşbəxt şəxsiyyətlərdən idi. Tarix yaradan şəxsiyyət kimi nüfuz qazanan Ümummilli Liderin xidmətlərinin, Vətəninə, xalqına sevgisinin aydın mənzərəsini formalaşdırır. Müasir Azərbaycan tarixində yeni eranın başlanğıcı sayılan həmin gün böyük dövlət xadimi, Ümummilli Lider **Heydər Əliyevin** respublikamıza rəhbərlik etməyə başlaması kimi son dərəcə qiymətli bir hadisə ilə əbədiləşmişdir. O öz vətənini, millətini ürəkdən sevən bir Şəxsiyyət, Lider kimi bütün bu dövr ərzində Azərbaycanın taleyüklü məsuliyyətini öz çiyinlərində daşımış, onu bir dövlət və xalqımızı bir millət kimi tarixin ağır və təlatümlü sınaqlarından çıxarmış, müasir müstəqil Azərbaycan dövlətinin, onun xoşbəxt gələcəyinin bünövrəsini qoymuşdur.

**Ulu öndərin** Azərbaycan dövlətçiliyi tarixindəki özünəməxsus və əvəzsiz yerini **Prezident** İlham Əliyev belə dəyərləndirib: **"Tarixdə şəxsiyyətlərin rolu danılmazdır. Ulu öndər Heydər Əliyevin fəaliyyəti buna bariz nümunədir. Bütün dövrlərdə - həm 1970-ci illərdə və 1980-ci illərin əvvəllərində Azərbaycan Kommunist Partiyasının rəhbəri olduğu dövrdə, həm də müstəqil Azərbaycanın Prezidenti kimi Heydər Əliyev öz fəaliyyəti ilə doğma xalqına xidmət etmişdir. Heydər Əliyev 1969-cu ildə rəhbərliyə gələndə Azərbaycan həm iqtisadi baxımdan, həm də sosial məsələlərin həlli baxımından 15 müttəfiq respublika arasında ən geridə qalmış vəziyyətdə idi. 1982-ci ildə isə artıq Azərbaycan həm iqtisadi və sənaye artımı baxımından, həm infrastruktur layihələrin mövcudluğu baxımından və bütövlükdə, inkişaf baxımından keçmiş SSRİ-də birinci ölkə idi. Eyni zamanda, biz bunu müasir tarixdə də görürük. 1993-cü ildə Azərbaycan, demək olar ki, ən ağır vəziyyətdə olan yeni müstəqil dövlətlərdən biri idi. Bəlkə də, birincisi idi. İndi Azərbaycan bu ölkələr arasında ən qabaqcıl mövqelərdədir. Bizim nailiyyətlərimiz başqa ölkələrlə müqayisə oluna bilməz. Bizim iqtisadi inkişafımız, həyata keçirdiyimiz nəhəng, transmilli layihələr onu göstərir ki, Azərbaycan çox uğurla inkişaf edən ölkədir".**

Sovet Azərbaycanında sosial-iqtisadi həyatının dirçəlişi, milli-mənəvi və mədəni dəyərlərinin inkişaf etdirilərək dünya ictimayyətinə çatdırılması məhz Onun titanik fəaliyyətinin nəticəsidir.



## XALQIN ETİMADINI DOĞRULDAN RƏHBƏR

**Heydər Əliyevin** - uzaqgörən dahi insanın Azərbaycanda rəhbərliyə başlaması respublikanın xilası üçün yeganə düzgün yol idi. Beləliklə, keçmiş sovet Azərbaycan KP MK-nın 1969-cu il 14 iyul tarixli plenumunda Heydər Əlirza oğlu Əliyev birinci katib seçildi. Həmin plenumdakı çıxışında **Ulu öndər** özünün fəaliyyət platformasını çox konkret şəkildə ifadə etdi: **«Mənə təzəcə tapşırılan bu vəzifənin bütün məsuliyyətini dərk edirəm. Qarşıma qoyulan öhdəliklərin çətinliyini, ağırlığını anlayıram və var qüvvəmlə çalışacağam ki, mənə göstərilən etimadı doğruldum... Mənə elə gəlir ki, bizim gələcək uğurlarımızın rəhni yalnız aktiv, birgə zəhmət ola bilər».**

1969-cu ildən başlanan böyük quruculuq və yüksəliş mərhələsi qısa müddətdə Azərbaycanı bütün sahələrdə geniş tərəqqi yoluna çıxardı. Azərbaycanda **Heydər Əliyevin** birinci hakimiyyəti dövründə (1969-1982) sosial, siyasi, iqtisadi və mədəni həyatın bütün sahələrində ölçüyəgəlməz uğurlar qazanılmış, qüdrətli iqtisadi potensial, maddi-texniki baza yaradılmış, əhalinin rifahı xeyli yüksəlmiş, elm, təhsil,

mədəniyyət güclü inkişaf prosesi keçmiş, milli şüurun oyanışı və dirçəldilməsi istiqamətində çox mühüm işlər görüldü. **Heydər Əliyevin** respublikaya rəhbərlik etdiyi illərdə sənayedə 581 adda yeni tipli maşın, avadanlıq, aparat, cihaz nümunələri yaradılmış, 310 avtomatlaşdırılmış xətt, 1300 kompleks mexanikləşdirilmiş sex, istehsal sahəsi və i.a. yaradılmışdır. 1970-ci ildən başlayaraq Azərbaycan sənaye məhsulunun artım sürətinə görə müttəfiq respublikalar arasında ən qabaqcıl mövqeyə çıxmışdı. Respublikada kənd təsərrüfatı və onun xam malını emal edən sahələr böyük sürətlə inkişaf edirdi. 1970-1982-ci illərdə kənd təsərrüfatı məhsulu 2,6 dəfə, əmək məhsuldarlığı 2,2 dəfə artmışdı. Bütün bunlar inkişafın ümumiləşdirilmiş göstəricisi olan milli gəlirin sürətlə artmasına səbəb oldu.

Eyni zamanda, Azərbaycan dilinin dövlət dili kimi Konstitusiya səviyyəsində rəsmi status qazanması da dahi rəhbərin qətiyyəti, siyasi iradəsi hesabına gerçəkləşdi. Möhtəşəm fəaliyyəti ilə şöhrətlənən dahi **Heydər Əliyev** 1982-ci ildə keçmiş SSRİ Nazirlər Soveti sədrinin birinci müavini vəzifəsinə irəli çəkildi. Moskvaya getməzdən əvvəl, 1982-ci il dekabrın 2-də Azərbaycan KP MK-nın büro iclasında **Ulu öndər** respublikaya on üç il yarımlıq rəhbərlik dövrünün yekunlarını məmnunluqla, fəxrlə ümumiləşdirərək demişdi: «**Bu illər ərzində böyük işlər görülüb, respublika böyük uğurlar əldə edib. Biz uzunmüddətli geriləməni qısa müddətdə aradan qaldırmağa nail olmuşuq. Respublikamız ümumittifaq miqyasında ən qabaqcıl mövqelərdədir... Respublikada çox gözəl, sağlam mənəvi-siyasi, mənəvi-psixoloji atmosfer hökm sürür, sözün qısası, bizim respublika yüksəklərə, çox yüksəklərə qalxıb**».

## AZƏRBAYCANI BƏLALARDAN QURTARAN İKİNCİ BÖYÜK QAYIDIŞ




XX əsrin son illiyi ölkəyə başçılıq edən idarəetmədən bixəbər şəxslərin bacarıqsızlığı, səbatsızlığı, səriştəsizliyi ağır nəticələrə gətirib çıxarmışdı. Ölkə daxilində iqtisadi islahatlar aparılmamış, əksər müəssisələr fəaliyyətini dayandırmış, əhalinin maddi durumu pisləşmiş, siyasi arenada hərc-mərclik, öbaşıpozuqluq meyilləri baş qaldırmış, demokratik dəyərlərin təşəkkülü istiqamətində heç bir iş görülməmişdi. Cənubda qondarma «Talış-Muğan Respublikası», Şimalda «Sadval»çıların «Ləzgistan» xülyaları, Qarabağda erməni işğalı, Gəncəbasarda Surət Hüseynovun başçılıq etdiyi silahlı qiyamçıların əməlləri ölkənin ərazi bütövlüyünə, suverenliyinə ciddi təhlükə yaratmışdı. Belə bir vaxtda xalq yeganə düzgün, ağıllı yolu seçdi - dünya şöhrətli siyasi xadim, müdrik dövlət adamı **Heydər Əliyevi** təkidlə ölkə rəhbərliyinə dəvət etdi. 1993-cü il iyunun 9-da xalqın tələbi ilə **Heydər Əliyev** gərgin situasiyada yaşayan Bakıya gəldi. On minlərlə vətəndaş Bakı hava limanına axışaraq öz müdrik xilaskarını qarşıladı. 1993-cü il iyunun 15-də xalqın qətiyyətli istəyi gerçəkləşdi. **Heydər Əliyev** Azərbaycan Respublikasının Milli Məclisinə Sədr seçildi. 1993-cü il oktyabrın 3-də xalqın böyük dəstəyi ilə **Prezident** seçilən **Heydər Əliyev** Azərbaycana rəhbərlik etdiyi on il müddətində (1993-2003-cü illər) neçə-neçə qərinəyə sığmayan son dərəcə böyük işlər gördü. Bəli, **Heydər Əliyev** Azərbaycanı Azərbaycana qaytardı, müstəqil Azərbaycanın xilaskarı və qurucusu kimi son dərəcə məsuliyyətli və şərəfli bir missiyanı yüksək səviyyədə yerinə yetirdi.



## ƏLİYEV EPOXASININ VÜSƏT VƏ ƏZƏMƏTİ

1982-ci il dekabrın 2-də Moskvaya getməzdən əvvəl, Azərbaycan KP MK-nın büro iclasında **Ulu öndər** respublikaya on üç il yarımlıq rəhbərlik dövrünün yekunlarını, fəxrlə ümumiləşdirərək demişdi: **«Bu illər ərzində böyük işlər görülüb, respublika böyük uğurlar əldə edib. Biz uzunmüddətli geriləməni qısa müddətdə aradan qaldırmağa nail olmuşuq. Respublikamız ümumittifaq miqyasında ən qabaqcıl mövqelərdədir... Respublikada çox gözəl, sağlam mənəvi-siyasi, mənəvi-psixoloji atmosfer hökm sürür, sözün qısası, bizim respublika yüksəklərə, çox yüksəklərə qalxıb».** Bütün bunlar isə 1969-cu il iyulun 14-dən başlanan şanlı **Heydər Əliyev** epoxasının vüsət və əzəmətinin parlaq təzahürü idi.

1982-87-ci illərdə keçmiş SSRİ Nazirlər Soveti sədrinin birinci müavini vəzifəsində çalışan görkəmli dövlət xadimi Azərbaycanı bir an da unutmamış, bütün imkanlarını, gücünü və bacarığını respublikamızın tərəqqisinə yönəltmişdi. Aydın, yetkin siyasi mövqeyə,

böyük vətəndaş qeyrətinə malik **Heydər Əliyev** Bakıda da, Moskvada da zaman-zaman Azərbaycanın əleyhdarlarının təzyiqləri ilə üzləşmiş, lakin heç bir qüvvə Onu haqq yolundan, xalqa və yurda fədakar xidmət amalından döndərə bilməmişdi. **Ulu öndər** söyləyirdi ki; **"Mən çox böyük sınaqlardan keçmiş bir adamam, həyatımı da özümə yox xalqıma həsr etmişəm."** 1987-ci ildə tutduğu yüksək vəzifədən istefa verəndə də **Heydər Əliyev** öz siyasi iradəsinin, mövqeyinin dəyişmədiyini bir daha nümayiş etdirdi. 1990-cı ilin yanvarında sovet qoşun hissələrini Bakıya yeridib dinc əhaliyə qanlı divan tutan imperiya rəhbərliyinə də ilk kəskin etiraz səsini məhz **Ulu öndər Heydər Əliyev** ucaltdı.

1990-cı il iyulun 20-də Moskvadan Bakıya, iki gün sonra isə Naxçıvana gələn qeyrətli Vətən oğlu əhali tərəfindən böyük məhəbbətlə qarşılandı. Həmin vaxt Naxçıvan son dərəcə acınacaqlı bir şəraitdə yaşayırdı. Belə bir vaxtda **Heydər Əliyevin** Naxçıvana qayıdışı xalqın əsl nicatına çevrildi. 1990-cı il sentyabrın 30-da keçirilən seçkilərdə Naxçıvan və Azərbaycan parlamentlərinə mandat qazanan **Ulu öndər** xalqın təkidli tələbi ilə 1991-ci il sentyabrın 3-də muxtar respublikada ali vəzifəyə dəvət olundu. Fəaliyyətinin Naxçıvan dövründə **Heydər Əliyev** ölkəmizin ən nüfuzlu, qüdrətli, mütəşəkkil, kütləvi siyasi təşkilatı olan Yeni Azərbaycan Partiyasını yaratdı, qısa müddətdə bu partiya xalqın maraqlarının əsl ifadəçisi və müdafiəçisinə çevrildi. 1991-ci ildə Azərbaycan öz dövlət müstəqilliyini elan etsə də çox keçməmiş ağır problemlər burulğanına yuvarlanırdı.

**Ulu öndər Heydər Əliyevin** Azərbaycana ikinci rəhbərlik dövrü müstəqil dövlət quruculuğu prosesinin hərtərəfli şəkildə və böyük uğurla həyata keçirilməsi ilə səciyyələnir. **«Azərbaycanın dövlət müstəqilliyi bizim üçün ən əziz, ən qiymətli nailiyyətdir və bu nailiyyəti - dövlət müstəqilliyimizi biz daima qoruyub saxlayacağıq»** - deyən Ümummilli Lider bu tarixi nailiyyətin, milli istiqlalımızın qorunub saxlanması və möhkəmləndirilməsi üçün misilsiz işlər gördü, sinəsini sipər edib Vətəni və xalqı bəlalardan qorudu. **Ulu öndər** vurğulayırdı ki: **"Mənim həyatım da fəaliyyətim də yalnız və yalnız Azərbaycanın müstəqilliyinin qorunub saxlanmasına ölkəmizin bu ağır vəziyyətdən qalxmasına həsr olunacaqdır."**

Dahi rəhbərin müdrik siyasəti nəticəsində ölkədəki özbaşınalıq, anarxiya aradan qaldırıldı, qanunların aliliyinə, hüquqi-demokratik

prinsiplərə əsaslanan idarəçilik sistemi yaradıldı, vətəndaş həmrəyliyi bərpa olundu, iqtisadi tərəqqiyə geniş rəvac verən qlobal layihələrin gerçəkləşdirilməsinə başlanıldı, Azərbaycanın beynəlxalq aləmdə mövqeyinin möhkəmləndirilməsi, Qarabağ münaqişəsinin ədalətli həlli, haqq işimizin dünyada tanıdılması istiqamətində mühüm tədbirlər gerçəkləşdi.

Xarici neft şirkətləri ilə «Əsrin müqaviləsi» adlanan kontraktın imzalanması, Bakı-Tbilisi-Ceyhan neft kəmərinin çəkilişi istiqamətində görülən nəhəng işlər, ölkəmizin beynəlxalq təşkilatlarda layiqincə təmsil olunması, onun mənafelərinin əzmlə qorunması, müstəqil Azərbaycanın hüquqi-demokratik prinsiplərə əsaslanan Konstitusiyasının qəbulu, mənəvi dəyərlərin müdafiəsi, mədəni dirçəlişə böyük qayğı, iqtisadiyyatın əsaslı şəkildə yenidən qurulması, bazar münasibətlərinin tənzimlənməsi, aqrar islahatın müvəffəqiyyətlə aparılması, ümumi daxili məhsulun ciddi artımı, dünya azərbaycanlılarının həmrəyliyinin formalaşdırılması, xaricdə yaşayan soydaşlarla sıx əlaqələrin təşəkkülü, minlərlə yeni iş yerlərinin yaradılması, əhalinin maddi rifah halının əsaslı şəkildə yaxşılaşdırılması, bir sözlə, müstəqil Azərbaycanın sosial, siyasi, iqtisadi və mədəni həyatının bütün sahələrində ciddi, hərtərəfli, möhtəşəm yüksəlişin baş verməsi **Heydər Əliyevin** qlobal fəaliyyətinin saysız-hesabsız bəhrələrindəndir.

**Ulu öndər** söyləyirdi ki: **"Demokratik prinsiplər həyatımın, fəaliyyətimin əsasını təşkil edir."**

Bəli, **Heydər Əliyev** Azərbaycanı Azərbaycana qaytardı, müstəqil Azərbaycanın xilaskarı və qurucusu kimi son dərəcə məsuliyyətli və şərəfli bir missiyanı yüksək səviyyədə yerinə yetirdi.



## SİYASİ İRSİN DAVAMI

XXl əsrdən Azərbaycan Respublikası **Prezidenti** İlham Əliyevin rəhbərliyi ilə tarixin ən qüdrətli çağlarını yaşayan, ölkəmizin qazandığı nailiyyətlər **Ulu öndərin** onilliklər ərzində gələcək inkişaf üçün formalaşdırdığı möhkəm təməllərdən güc alır. **Ali Baş Komandan** İlham Əliyevin əmri ilə torpaqlarımızı düşməndən azad edən qəhrəman əsgər və zabitlərimiz **Heydər Əliyev** siyasətinin, **Ulu öndərin** vətənpərvərlik məktəbinin yetirdiyi nəslin təmsilçiləridirlər. Cəmi 44 gün ərzində düşməni məhv edən, təcavüzkar Ermənistanın öz ordusu haqqında yaratdığı bütün saxta mifləri dağıdan Azərbaycan Ordusunun bu qüdrəti Ümummilli Liderin müəyyənləşdirdiyi və **Prezident** İlham Əliyevin əzmlə həyata keçirdiyi inkişaf siyasətindən, qazanılan nailiyyətlərdən, Vətənə, torpağa bağlılıqdan, Azərbaycana sevgisindən irəli gəlir.

Erməni işğalından azad edilmiş ərazilərimizdə tikinti-quruculuq işləri geniş vüsət alıb. Bu, **Heydər Əliyev**ə xas



missiyadır. Onun işıqlı amalları bu gün adını daşıyan **Heydər Əliyev** Fondunun fəaliyyətində də yaşayır. Azərbaycan Respublikasının Birinci vitse-**prezidenti**, **Heydər Əliyev** Fondunun rəhbəri, xoşməramlı səfir **Xanım Mehriban Əliyevanın** irəli sürdüyü layihələrlə Ümummilli Liderimizin ideyaları bütün dünyada xeyirxahlıq, mərhəmət, sevgi, tolerantlıq, fərqli mədəniyyətlərə hörmət ruhunun işığı kimi yayılır. insana və insanlığa xidmət edir. Bir sözlə, müstəqilliyin yolları ilə inamla irəliləyən Azərbaycanda **Ulu öndərin** amal və əməlləri dönmədən həyata keçirilir. Ölkəmiz **Heydər Əliyev** siyasi kursunun layiqli davamçısı **Prezident** İlham Əliyevin rəhbərliyi ilə bütün sahələrdə yeni-yeni uğurlar qazanır.

Qeyd etdik ki, Azərbaycanın ikinci dəfə müstəqilliyə gedən yolunun əsasında tarixi şəxsiyyət, dahi **Heydər Əliyevin** ölməz

ideyaları, xidmətlərinin rolu dayanır. Müasir Azərbaycan tarixində yeni eranın başlanğıcı sayılan 14 iyul 1969-cu il böyük dövlət xadimi, ümummilli lider **Heydər Əliyevin** respublikamıza rəhbərlik etməyə başlaması kimi son dərəcə qiymətli bir hadisə ilə əbədiləşmişdir. Həmin dövrdə Azərbaycanın siyasi, sosial-iqtisadi və mədəni durumu heç də ürəkaçan deyildi. O zamankı sovetlər birliyinin ən ucqar respublikalarından biri kimi səciyyələnən Azərbaycanda idarəetmədə çoxlu nöqsanlara yol verilmiş, iqtisadiyyat geri qalmış, sosial-mənəvi mühit şəffaflıqdan uzaq düşmüşdü. Belə bir vaxtda **Heydər Əliyevin** respublikanın ali vəzifəsinə seçilməsi tariximiz və taleyimiz, Vətənimiz və xalqımız üçün, sözün əsl mənasında, dönüş və xilas, möhtəşəm tərəqqi və yüksəliş erasının əsasını qoydu. **Ulu öndər** qeyd edirdi ki: **"Mən bu böyük yükü ancaq ona görə çiynimə götürmüşəm ki, xalqın həyatının ən çətin dövründə ona xidmət göstərim".** Bir sözlə, 1969-cu il iyulun 14-dən başlanan şanlı **Heydər Əliyev** epoxasının vüsət və əzəmətinin parlaq təzahürü idi. Azərbaycan xalqının böyük oğlu mərkəzi hökumətdə tutduğu vəzifənin imkanlarından istifadə edərək, İttifaq əhəmiyyətli bir sıra böyük layihələri Bakıya yönəltdi. Həmin illərdəki coşqun fəaliyyəti, yüksək işgüzarlığı, fitri təşkilatçılıq bacarığı onu daha da şöhrətləndirdi. Mixail Qorbaçov SSRİ-də siyasi hakimiyyətə gəldikdən sonra **Heydər Əliyev**ə münasibət dəyişdi. Baş katiblə aralarında yaranmış ciddi fikir ayrılığı səbəbindən 1987-ci ildə tutduğu vəzifələrdən istefa verdi. Bundan bir il sonra Dağlıq Qarabağda separatçılıq hərəkatı baş qaldırdı, Azərbaycanın qara günləri başladı. Yəqin ki, o vaxt **Heydər Əliyev** rəhbərlikdə olsaydı, Azərbaycan xalqı Qarabağ problemi ilə, qara Yanvarla və digər faciələrlə üzləşməzdi. 1990-cı illərin əvvəlində - Vətənin ağır günlərində **Ulu öndər** Azərbaycana qayıtdı. O vaxtkı rəhbərlik onun Bakıya yolunu kəsdiyi üçün doğulub boya-başa çatdığı Naxçıvana getdi. Naxçıvan Ali Sovetinin Sədri seçilən **Heydər Əliyev** muxtar respublikanı erməni təcavüzündən, siyasi təlatümlərdən qorudu. Yetmiş ildən sonra ilk dəfə Naxçıvanda üçrəngli bayrağımızı ucaltdı.



1993-CÜ İL 15 İYUNDA XİLASKAR MİSSİYALI QAYIDIŞ

**ULU ÖNDƏR HEYDƏR ƏLİYEVİN XALQLA, MİLLƏTİ İLƏ BÜTÜNLƏŞMƏSİ, BÜTÖVLƏŞMƏSİNİN YOLU MÜSTƏQİLLİKDİR!** Həqiqətən də, bu illərin heç birində O, xalqından ayrı, kənarda olmayıb. Ən əsası odur ki, xalq, millət bu illər ərzində heç vaxt özünü Ümummilli Liderimiz **Heydər Əliyev**dən, Onun böyük və müdrik rəhbər dühasından ayrı görməyib. Məhz özü də söyləyirdi ki: "Azərbaycanın belə dağılan vəziyyətində, parçalanan vaxtı mən bir məqsəd daşımışam- Azərbaycanı bu fəlakətdən xilas edim". Məhz bu səbəbdəndir ki, Azərbaycan xalqı bu illərdə özünü tənha, arxasız və güvənsiz hiss etməyib. Təsadüfi deyil ki, Azərbaycan xalqı 1993-cü ilin yayında müstəqil dövlətçiliyimiz, milli gələcəyimiz uçurumun kənarında dayananda, Azərbaycanı vətəndaş qarşıdurması, zülmət




və parçalanma gözləyəndə, yenə də öz gerçək Liderinə - **Heydər Əliyev** müdrikliyinə üz tutdu. Bu, xalqın liderinin xalqın çağırışına səs verib, Onun hüzuruna qayıdışı idi. Bu, eyni zamanda, xalqın artıq qəribsədiyi güvənli, təhlükəsiz və arxayın həyata qayıdışı, sabaha inam və etimadının bərpası idi... **Heydər Əliyevin** Azərbaycana rəhbərliyə gəlməsinin hər səhifəsi Azərbaycanın inkişaf, sınaq və özünütəsdiq səhifəsidir. Bu səhifələri vərəqləmək Azərbaycan tarixinin bütöv bir qərinəsinə nəzər salmaq deməkdir. Və ...

**Ulu öndərin** ikinci dəfə siyasi hakimiyyətə gəlişi nəinki Azərbaycanı, bütöv bir xalqı məhv olmaq təhlükəsindən xilas etdi. Xalq ən ağır günlərini yaşadığı bir zamanda sevimli oğlunu, dahi şəxsiyyət **Heydər Əliyevi** ölkəni idarə etməyə çağırdı. O günlər haqqda **Ulu öndər** söyləyirdi: **"Mən bu gün bir daha o anları, o dəqiqələri, o saatları, o gərgin gecəni, oktyabrın o işıqlı günəş şüaları ilə işiqlanmış Bakını yadıma salıram. Əmin idim ki, xalq mənim səsimə səs verəcəkdir".** Bu təkidli çağırışın arxasında sonsuz xalq etimadı, millətin məhəbbəti və inamı dayanırdı. Lakin onun birinci hakimiyyəti dövründəki abad Azərbaycandan heç nə qalmamışdı. Ümummilli Liderin 1993-cü il iyunun 15-də Azərbaycanda siyasi hakimiyyətə xilaskar missiyalı qayıdışı xalqın milli dövlətçiliyinə və sabahkı gününə inamını özünə

qaytardı, ölkə həyatının bütün sahələrinə nüfuz etmiş böhran aradan qaldırıldı, Qarabağ cəbhəsindəki uğursuzluqların qarşısı alındı, ictimai-siyasi sabitlik, milli-mənəvi həmrəylik və vətəndaş sülhü təmin edildi, ən başlıcası isə itirilməkdə olan dövlət müstəqilliyi qorunub saxlanıldı.

1993-cü il oktyabrın 3-də ümumxalq səsverməsi nəticəsində **Heydər Əliyev** Azərbaycan Respublikasının **Prezident**i seçildi. Ümummilli liderin həyata keçirdiyi təxirəsalınmaz tədbirlər nəticəsində ölkəmiz müstəqilliyini itirmək, parçalanmaq, vətəndaş müharibəsi təhlükəsindən xilas oldu.

1994-cü ilin sentyabrında «Əsrin müqaviləsi» adlandırılan neft müqaviləsinin imzalanması müstəqil Azərbaycan dövlətinin beynəlxalq arenada strateji mahiyyət kəsb edən möhtəşəm qələbəsi idi. 1995-ci ildə müstəqil Azərbaycan Respublikasının ilk Konstitusiyası qəbul edildi. 1998-ci ildə şərqdə ilk dəfə olaraq Azərbaycanda ölüm hökmü ləğv olundu.

**Heydər Əliyev** üçün müstəqil Azərbaycan fəlsəfəsinin təməlində azadlıq, demokratiya, iqtisadi tərəqqi, sosial ədalət və rifah dururdu. Hakimiyyətin bölünmə prinsipinin təsbit olunması, hüquq normalarının və qanunvericilik bazasının beynəlxalq standartlara uyğunlaşdırılması, müasir idarəetmə üsullarının bərqərar olması və müvafiq dövlət qurumlarının formalaşdırılması Ümummilli Liderin rəhbərliyi ilə gerçəkləşən genişmiqyaslı quruculuq proqramının tərkib hissələridir. Azərbaycanda müasir, demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu, vətəndaş cəmiyyətinin təşəkkülü, milli-mənəvi dəyərlərə qayıdış və elmin, təhsilin, mədəniyyətin inkişafı əbədi surətdə Dahi Şəxsiyyətin adı ilə bağlıdır.

1998-ci il oktyabrın 11-də **Ulu öndər** yenidən yekdilliklə Azərbaycan Respublikasının **Prezident**i seçildi. Bu, Ümummilli Liderə olan sonsuz etimadı, məhəbbəti, inamı bir daha sübut edirdi. **Heydər Əliyevin** fəaliyyətinin 1993-2003-cü illəri bir ömrün qızıl salnaməsidir. **Ulu öndər** həmin dövrdə Azərbaycanı yalnız parçalanmaqdan, dövlət çevrilişlərindən, özbaşınalıqlardan xilas etmədi, həm də xalqımıza yeni, firavan, ildən-ilə gözəlləşən bir həyat, müstəqilliyi daha da möhkəmləndirilmiş Azərbaycanı bəxş etdi.



## HEYDƏR ƏLİYEV İDEYALARINI GERÇƏKLƏŞDİRƏN PREZİDENT İLHAM ƏLİYEV

**Ulu öndər** söyləmişdir ki: «**İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm».** Bu, sadəcə, **Heydər Əliyevin** taleyüklü məsələləri inandığı bir insana həvalə etməsi deyildi. Burada dahi liderin uzaqgörənliyi də aydın sezilir. **Ulu öndər Heydər Əliyevin** 2003-cü ildə xalqa müraciətində əksini tapan bu fikirlər **Prezident** İlham Əliyevin son illər gördüyü işlərə, Azərbaycanın əldə etdiyi uğurlara, ən əsası bugünkü qələbəmizə bələdçilik edir: bugünkü qələbənin məntiqi əsası, bünövrəsi və onu yaradan fəlsəfə **Heydər Əliyevin** fəaliyyətinin məhsuludur. **Ulu öndər** söylədiyi kimi: **"Əsas məqsədlərimiz, amallarımız yolunda hamı birləşməlidir"**.

**Prezident** İlham Əliyev xalqımızın ən böyük arzularını gerçəkləşdirən Şəxsiyyət kimi, eyni zamanda, **Müzəffər** Liderlik adını əbədi olaraq tarixə yazdı. O, son 200 ildə tarixi torpaqlarını ardıcıl

şəkildə itirməyə məhkum edilmiş Azərbaycan xalqının milli mənliyini, mənəvi ruhunu və siyasi gücünü özünə qaytardı, tarixi ədaləti bərpa etdi. Məhz bu tarixi həqiqətləri incələdikdən sonra vurğulaya bilərik ki, **Müzəffər Ali Baş Komandan**ımız İlham Əliyevin ardıcıl, uğurlu siyasəti nəticəsində dövlətçilik ənənələrimiz yenidən dirçəldi və inkişaf etməyə başladı.

Eyni zamanda, Azərbaycan dövləti **Prezident** İlham Əliyevin Liderliyi sayəsində dünyada qalibiyyət və zəfərlər yazan, öz gücü ilə ərazi bütövlüyünü bərpa edən qüdrətli ölkə olaraq tanınmaqdadır. **Prezident** İlham Əliyev sübut etdi ki, heç bir qüvvə Azərbaycanı haqq yolundan, torpaqlarının işğaldan azad edilməsi uğrunda mübarizədən saxlaya bilməz. O, siyasi peşəkarlıqla Azərbaycana qarşı beynəlxalq miqyasda diplomatik cəbhənin formalaşmasının qarşısını aldı.

**Ulu öndər** məntiqi ilə desək: **"Mən hər bir kəsə tövsiyə edirəm ki göstərilən etimadı qiymətləndirsin, etimada sədaqətlə xidmət etsin".**

Uzaqgörən liderin siyasi kursunun böyük uğurla davam etdirilməsi nəticəsində möhtəşəm tarixi zəfərə imza atıldı. **Müzəffər Ali Baş Komandan Müzəffər** Ordusu ilə qələbə qazandı! Ümummilli Liderin ən böyük arzusunu gerçəkləşdirdi, Azərbaycanın ərazi bütövlüyü bərpa edildi! Əbəs deyil ki, **Müzəffər Ali Baş Komandan** İlham Əliyev Azərbaycan xalqına qələbə xəbərini çatdırarkən də **Ulu öndərin** ruhunun şad olduğunu dedi: **"Mən bu gün, eyni zamanda, Ulu öndər Heydər Əliyevin qəbrini ziyarət etdim. Onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim ki, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdim. Bu, böyük qələbədir. Əziz Şuşa, biz qayıtmışıq! Əziz Şuşa, biz səni dirçəldəcəyik! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!».**

Qarabağ torpaqlarının 30 illik işğaldan azad edilməsi ilə Azərbaycanın gələcək inkişafı üçün yeni imkanlar açıldı. Bu inkişafa gedən yol isə yenə də **Heydər Əliyev** yoludur!

Çünki **Heydər Əliyev** yolunun işığında Qalib Lider, **Ali Baş Komandan**, **Prezident** İlham Əliyev Azərbaycanı daim yeni-yeni uğurlara, nailiyyətlərə, zəfərlərə aparır və aparacaqdır!



## QURUCULUQ MISSIYASININ BAŞLANĞICI

**«Heç bir millət şəxsiyyətsiz yaşaya bilməz».** Bu fikir Azərbaycan adını öndə gedən dünya ölkələri sırasına yazan, öz uzaqgörənliyi ilə dünya siyasətçilərini daim heyrətə gətirməyi bacaran, millətin hər bir nümayəndəsini ürəkdən sevən dahi şəxsiyyət, **Ulu öndər Heydər Əliyev**ə məxsusdur! Əslində doğru deyiblər ki, zaman hər şeyi yerbəyer edir, hər şeyin, hər kəsin doğru qiymətini verir. İllər keçdikcə, Ümummilli Liderimiz **Heydər Əliyevin** böyüklüyünü, müdrikliyini, xalqını, vətənini necə bir məhəbbətlə sevdiyini daha çox anlayırıq. Bu siyasət nəhənginin fəaliyyəti bütün bəşəriyyətin xoşbəxt gələcəyi uğrunda mübarizəyə həsr olunmuşdur. **Ulu öndərin** öz məntiqi ilə desək: **"Azərbaycan xalqı dünya sivilizasiyası xəzinəsinə böyük töhfələr vermişdir". Ulu öndər** də Azərbaycanın milli sərvəti, milli Dühasıdır.

Belə ki, tarixin xalqımıza bəxş etdiyi dahi şəxsiyyətin, müasir Azərbaycanın xilaskarı və memarı, **Ulu öndəri Heydər Əliyevin** bütün fəaliyyətinin məqsədi Azərbaycanı güclü, demokratik dövlətə

çevirmək və xalqına firavan həyat bəxş etmək idi. Azərbaycanın ən yeni tarixinin bütöv bir dövrü onun şərəfli adı və möhtəşəm fəaliyyəti ilə bağlıdır. Ümummilli Lider **Heydər Əliyev** Azərbaycan xalqının dünyaya bəxş etdiyi nadir şəxsiyyət, böyük dövlət xadimi, xalqını böyük xalqların, dövlətini böyük dövlətlərin cərgəsinə çıxaran müdrik rəhbər idi. 1991-ci il sentyabrın 3-də Naxçıvan Muxtar Respublikası Ali Məclisində keçirilən fövqəladə sessiyada deputatların və iclas zalının qarşısına toplaşan minlərlə insanın təkidi ilə xalqımızın xilaskarı, müstəqil Azərbaycan Respublikasının qurucusu və memarı, ümummilli liderimiz **Heydər Əliyev** Ali Məclisin Sədri seçilməklə, qədim Naxçıvanda milli qurtuluşun, milli dövlətçiliyin təməli qoyuldu.

1991-ci ilin 3 sentyabr tarixi yenicə müstəqilliyini qazanmış Azərbaycanın müasir tarixində, sadəcə, sıradan bir təqvim günü deyildi. Bu tarix 70 ildən çox müstəqillik arzuları ilə yaşayaraq onu bərpa edən, lakin qısa bir zamanda bu azadlıq duyğularını itirmək qorxusu ilə üzləşən, xaos və anarxiya burulğanında çırpınan bir xalqın yenidən özündə böyük güc taparaq Böyük Lideri ilə böyük bir mübarizəyə başladığı gün idi.

Bu elə bir dövr idi ki, ölkəmizin əsas torpaqlarından ayrı düşmüş Naxçıvanın ətraf aləmlə bütün kommunikasiya-nəqliyyat əlaqələri kəsilmiş, insanların sabahkı günə inamı qalmamışdı. İnsanların yeganə təsəllisi **Ulu öndər Heydər Əliyevin** Naxçıvanda olması idi. Buna görədir ki, Ümummilli Lider Naxçıvanın, ümumilikdə isə Azərbaycanın gələcəyi baxımından əlamətdar olan bu gün haqqında danışarkən deyirdi: **«Bu zamanın, bu dəqiqələrin, bu saatın hökmünü nəzərə almaya bilməzdim... Xalqın bu əhval-ruhiyyəsini, tələblərini nəzərə alaraq bütün məsələləri götür-qoy etdim. Yəqin etdim ki, mən öz prinsiplərimə sadiq qalaraq, eyni zamanda indi Azərbaycanın, Naxçıvanın belə vəziyyətində, çətin günündə, dövründə mənim üzərimə nəinki deputatların, binanın qarşısında, ətrafına toplaşan naxçıvanlıların qoyduqları vəzifənin icrasından geri çəkilsəm, bu, xalqın ağır günündə qaçmaq deməkdir... Mən öz taleyimi xalqa tapşırmışam və xalqın iradəsini, yəqin ki, indi bu müddətdə, bu çətin dövrdə yerinə yetirməliyəm».**

1990-cı il noyabrın 17-də Naxçıvan parlamentinin yeni tərkibdə keçirilən ilk sessiyası deputatların istəyi və böyük təkidi nəticəsində ümummilli lider **Heydər Əliyevin** Sədrliyi ilə öz işinə başladı. Sessiyada

gündəliyə çıxarılan məsələlər və qəbul edilən tarixi qərarlar, ümumilikdə, Azərbaycanın müstəqilliyinə və suverenliyinə hesablanmışdı. Azərbaycan **Prezidenti** İlham Əliyev Naxçıvan Muxtar Respublikası Ali Məclisinin həmin dövrdə qəbul etdiyi qərarların tarixi əhəmiyyətindən danışarkən deyib: «O illərdə nəinki Naxçıvan üçün, Azərbaycan üçün də tarixi qərarlar qəbul edilmişdir. ...O vaxt Naxçıvanın adı dəyişdirildi. **Ulu öndərin** təklifi ilə «sovet sosialist» sözləri muxtar respublikanın adından çıxarıldı. Naxçıvanda ilk dəfə olaraq 1990-cı illərdə Azərbaycan Xalq Cümhuriyyətinin bayrağı dövlət bayrağı kimi qəbul edildi və Azərbaycanın Ali Soveti qarşısında vəsatət qaldırıldı ki, Azərbaycan dövləti də bu bayrağı rəsmi dövlət bayrağı kimi təsdiq etsin.

Nəzərə yetirək ki, 1991-ci ildə Sovet İttifaqının saxlanması üçün keçirilən qanunsuz referendumda Naxçıvan iştirak etməmişdir. Yəni bu addımlar ondan sonrakı dövrdə Azərbaycanın dövlət müstəqilliyini şərtləndirdi. O illərdə də **Ulu öndər** qətiyyət, cəsarət, öz xalqına, öz millətinə nə qədər bağlı olduğunu göstərmişdir. Bir daha göstərmişdir ki, Onun üçün dövlət maraqları, Azərbaycanın maraqları hər şeydən üstündür.

Göründüyü kimi, blokada vəziyyətinin yaratdığı çətinliklərə sinə gərən, düşmən təcavüzünə qarşı rəşadətlə müqavimət göstərən Naxçıvan **Ulu öndər Heydər Əliyev**ə böyük ümid bəsləyir, Ona güvənirdilər. Çünki Vətənə sədaqətlə xidmət nümunəsi göstərən dahi şəxsiyyət də öz xalqına güvənir, Ona arxalanırdı və həmişə xalq üçün yaşamış, xalq üçün fəaliyyət göstərmiş və doğma Vətəni uğrunda canını belə əsirgəməyəcəyini dəfələrlə bəyan etmişdi.

1991-ci il sentyabrın 3-də Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri seçildikdən sonra sessiyadakı ilk çıxışında **Ulu öndər** öz taleyini xalqa tapşırdığını bildirərək deyirdi: **«Mən bu zamanın, bu dəqiqələrin, bu saatın hökmünü nəzərə almaya bilməzdim. ... Mən öz prinsiplərimə sadiq qalaraq Azərbaycanın, Naxçıvanın belə vəziyyətində, çətin günündə, dövründə mənim üzərimə düşən vəzifənin ifasından geri çəkilə bilməzdim. Mən öz taleyimi xalqa tapşırmışam və xalqın iradəsini indi bu müddətdə, bu çətin dövrdə yerinə yetirməliyəm».**

Həmin illərdə dünya şöhrətli siyasətçi **Heydər Əliyev** Ali Məclisin Sədri kimi ilk növbədə üç tərəfdən düşmən hücumuna məruz qalan Naxçıvanın müdafiə qabiliyyətinin gücləndirilməsinə xüsusi

diqqət yetirdi. 1991-ci il sentyabrın 7-də Ali Məclis Naxçıvan Muxtar Respublikası Dövlət Müdafiə Komitəsinin yaradılması haqqında qərar qəbul etdi. Bu qərar Naxçıvanın müdafiəsinin gücləndirilməsi istiqamətində atılan ilk addım oldu. Sonrakı dövrlərdə qəbul edilmiş tarixi qərarlarla Naxçıvanda yerləşən sovet qoşunlarına məxsus hərbi texnika və silahların hamısının muxtar respublikada saxlanması təmin olundu, Muxtar Respublikada Milli Ordu yaradıldı, Naxçıvanın müdafiə potensialı gücləndirildi. **Ulu öndər** bəyan edirdi ki: **"Azərbaycanda silahla, zorakılıqla heç bir iş görmək olmaz".**

Naxçıvanın düşmən hücumundan və sosial-iqtisadi böhrandan xilası istiqamətində mühüm qərarlar qəbul edən dahi rəhbər digər tərəfdən Azərbaycanı müstəqil, xalqımızı firavan görmək istəyirdi. Ümummilli lider **Heydər Əliyev** Ali Məclisin Sədri olarkən dünya azərbaycanlılarını bir ideya ətrafında - Vətənə və xalqa xidmət uğrunda birləşməyə səsləməsi də bu istəkdən, bu arzudan irəli gəlirdi. Çünki xalq arasında sağlam ideologiyaya əsaslanan birlik olmadan ölkəni düşdüyü bəlalardan qurtarmaq və inkişaf yoluna çıxarmaq mümkün deyildi.

1991-ci il dekabrın 16-da Ali Məclis tərəfindən «31 Dekabr Dünya Azərbaycan Türklərinin Həmrəylik və Birlik Günü haqqında» Qərarın qəbul edilməsi bu mənada xüsusi əhəmiyyətə malikdir. Qərara əsasən, 1991-ci ilin son günü - 31 dekabrda həmrəylik bayramı ilk dəfə muxtar respublikada kütləvi tədbirlərlə qeyd olundu. Bu bayram artıq bütün dünya azərbaycanlıları tərəfindən birlik, həmrəylik günü kimi hər il böyük təntənə və qürur hissi ilə qeyd edilir.Ümummilli lider **Heydər Əliyev** Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri olarkən xarici iqtisadi əlaqələrin qurulması sahəsində də mühüm addımlar atdı.

**Ulu öndər** 1992-ci ildə qonşu Türkiyə Cümhuriyyətinə və İran İslam Respublikasına səfərlər etdi, keçirilən görüşlərdə iqtisadi sahədə əməkdaşlığa dair protokollar imzalandı, hər iki dövlətlə iqtisadi, mədəni, təhsil və digər sahələrdə qarşılıqlı münasibətlər quruldu.

Diqqətə yetirək ki, 1993-cü il fevralın 5-də Türkiyə Cümhuriyyətinin, martın 8-də isə İran İslam Respublikasının Naxçıvanda konsulluqları fəaliyyətə başladı.

## ZƏRURƏTDƏN YARANAN YAP TARİXİ MİSSİYALARINI LƏYAQƏTLƏ YERİNƏ YETİRİR

Xalqımızın və dövlətimizin taleyinin həll olunduğu bir dövrdə 1992-ci ilin noyabrında sosial sifariş olaraq meydana atılan Yeni Azərbaycan Partiyası ölkəmizdə qurtuluş və tərəqqinin simvolu kimi qəbul edilməklə bərabər, həm də Azərbaycan vətəndaşlarının mütləq əksəriyyətinin siyasi istinad mənbəyidir.

Ziyalılar, sadə insanlar Naxçıvan Muxtar Respublikasına üz tutaraq 1992-ci il oktyabr ayının 16-da **Ulu öndər Heydər Əliyev**ə Yeni Azərbaycan Partiyasının yaradılması xahişi ilə müraciət etdilər.

1992-ci il oktyabrın 24-də **Ulu öndərin** ziyalıların müraciətinə məktubla verdiyi müsbət cavab **Heydər Əliyevin** yaranmış vəziyyətdə böyük məsuliyyəti üzərinə götürməkdən çəkinməyən, cəsarətli və qətiyyətli lider olduğunu bir daha təsdiqlədi. Qeyd edək ki, müraciətlər «SƏS» qəzetində dərc olundu. **Ulu öndər Heydər Əliyevin** Azərbaycanın xilası naminə YAP-a rəhbərlik etməyə razılıq verməsi onun böyük siyasətə qayıdışının əsasını qoydu. **Ulu öndər** vurğulayırdı ki: **"Nə qədər partiya olur- olsun onların hamısı bir məqsədə- Azərbaycanın müstəqilliyini qorumaq, torpaqlarımızı düşməndən azad etmək işinə xitam etməlidir".**

1992-ci il noyabrın 21-də 550 nəfərdən ibarət təşəbbüs qrupu Naxçıvanda təsis konfransını keçirdi, partiyanın proqram və nizamnaməsini qəbul etdi. **Heydər Əliyev** yekdilliklə partiyanın Sədri seçildi.

Qısa bir müddətdə - Azərbaycan xalqı 1993-cü ilin oktyabrında Yeni Azərbaycan Partiyasının Sədri **Heydər Əliyev**ə etimad göstərərək Onu özünün **Prezident**i seçdi.

**Ulu öndər Heydər Əliyev** ideyaları **Prezident**, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Məhz bu səbəbdəndir ki, dünya şöhrətli dövlət xadimi, **Ulu** öndər **Heydər Əliyev** hələ 2003-cü ildə siyasi uzaqgörənliklə xalqa müraciətində hakimiyyət sükanının cənab İlham Əliyevə etibar olunmasını məsləhət bildi: **«Üzümü sizə - həmvətənlərimə tutaraq qarşıdan gələn prezident seçkilərində prezidentliyə namizəd, mənim siyasi varisim, Yeni Azərbaycan Partiyası sədrinin birinci müavini İlham Əliyevi dəstəkləməyə çağırıram. O, yüksək intellektli, praqmatik**



**düşüncəli, müasir dünya siyasətini və iqtisadiyyatını gözəl bilən, enerjili və təşəbbüskar bir şəxsiyyətdir».** Bununla da tarixi zərurətdən yaranan Yeni Azərbaycan Partiyası müstəqilliyimizin qorunmasında, dövlətçiliyimizin möhkəmləndirilməsində, tənəzzül etmiş iqtisadiyyatımızın inkişaf etdirilməsində və demokratik təsisatların bərqərar olunmasında siyasi flaqman rolunu hakim siyasi partiya olaraq öhdəsinə götürmüşdür.

Ümummilli lider **Heydər Əliyevin** müdrik, uzaqgörən və çevik daxili və xarici siyasətini özünün siyasi kursu elan etmiş, **Heydər Əliyev** idarəçilik məktəbinin layiqli davamçısı **Prezident** İlham Əliyev cənabları **Ulu öndərin** başa çatdıra bilmədiyi işləri yerinə yetirir. Artıq Qarabağ Azərbaycanındır!

Azərbaycan xalqının Qalib Lideri, Azərbaycan xalqının **Prezidenti** İlham Əliyev dəmir siyasətinin nəticəsində keçmiş «dağlıq qarabağ» problemi yoxdur!. **Prezident** İlham Əliyev bildirib ki, biz döyüş meydanında, siyasi müstəvidə Qələbə qazanmışıq və bu Qələbə



ölkəmiz üçün yeni dövr açır. Bu dövr inkişaf, təhlükəsizlik, tərəqqi dövrü olacaqdır: «**Bu dövrlə bağlı müraciətlərimi yenə də hər bir Azərbaycan vətəndaşının arzuladığı sözlərlə yekunlaşdırmaq istəyirəm: Cəbrayıl bizimdir, Füzuli bizimdir, Zəngilan bizimdir, Qubadlı bizimdir, Ağdam bizimdir, Kəlbəcər bizimdir, Laçın bizimdir, Şuşa bizimdir, Qarabağ bizimdir! Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan!**». Ona görə də **Ulu öndərin** fiziki yoxluğu dövründə ölkəsini, millətini düşünüb, müstəqilliyimizin əbədi olması uğrunda qətiyyətlə mübarizə apara biləcək Lider **Prezident** İlham Əliyevdir. Bütün bunlar isə **Heydər Əliyev** uzaqgörənliyinin, **Heydər Əliyev** zəkasının və **Heydər Əliyev** nurunun bizə tərəf saçılan əbədi şölələridir!

## MİLLİ QURTULUŞDAN ZƏFƏRƏ DOĞRU

Tariximizə Milli Qurtuluş Günü kimi daxil olmuş 15 iyun sadəcə, təqvim bayramı deyil, böyük ictimai, siyasi və tarixi əhəmiyyətə malik bir gündür. Çünki Ümummilli Lider **Heydər Əliyevin** 1993-cü il iyunun 15-də ikinci dəfə siyasi hakimiyyətə qayıdışı xalqımızın çoxəsrlik tarixinə taleyüklü möhtəşəm siyasi hadisə kimi daxil oldu.

15 iyun təkcə dövlətçiliyimizin xilası deyildi, həm də 44 günlük müharibədə möhtəşəm qələbənin təməli idi.

15 İyun - Milli Qurtuluş Günü xalqımızın Ümummilli Lideri **Heydər Əliyevin** hakimiyyətə qayıdışı ilə müstəqil dövlətçiliyimiz parçalanmaq və məhv olmaq təhlükəsindən, iqtisadi tənəzzüldən, beynəlxalq təcriddən xilas edildiyi, Azərbaycan xalqının gələcək həyatını müəyyən edən böyük başlanğıcların əsası olan tarixi gün. **Heydər Əliyevin** ikinci dəfə - 1993-cü ilin 15 iyun tarixində siyasi hakimiyyətə gəlişi, nəinki Azərbaycanı, bütöv bir xalqı məhv olmaq təhlükəsindən xilası, qurtuluşu idi. **Ulu öndərin** öz məntiqi ilə desək: **"Keçid dövrü yaşayan ölkələrə başçılıq etmək istəyən şəxslər gərək çox təcrübəli, dünyanı bilən adam olsun".**

**Ulu öndər** o dövrdə qardaş qırğınının, vətəndaş müharibəsinin qarşısını almağa həyatını təhlükəyə atmaqla, ölümündən çəkinməyərək nail oldu. Hakimiyyətdə olan AXC-Müsavat iqtidarının səriştəsizliyi, xalqı deyil, yalnız öz mənfəətlərini güdmələri, hər şeyi - ləyaqəti, şərəfi, vicdanı pula satmağı sonda Azərbaycanın öz müstəqilliyini itirmək təhlükəsi ilə qarşı-qarşıya qoydu. Talanmış dövlət büdcəsi iqtisadiyyatı çökdürmüş, daxili və xarici qüvvələr isə artıq separatçılıq vasitələri ilə ölkəni bölən «xəritələrini» hazırlamışdılar. Qarabağ cəbhəsində isə torpaqlarımız ard-arda erməni işğalçılarına peş-kəş edilirdi. Azərbaycan xalqı dövlətçiliyini itirmək təhlükəsi fonunda fəlakətlər, tüğyanlar burulğanında məhv olmaq üzrə idi. Bütün bunlardan isə çıxış yolu **Ulu öndər Heydər Əliyev** idi!

Ümummilli Lider **Heydər Əliyev** müstəqilliyimizin həmin mərhələsini belə xarakterizə edirdi: **«Azərbaycan böyük təhlükə qarşısında idi. Çünki Azərbaycanın müstəqil yaşamasının əleyhinə olan həm daxildəki qüvvələr güclü idi, həm də Azərbaycan kimi böyük coğrafi-strateji əhəmiyyətə, zəngin təbii sərvətlərə malik**



**olan ölkənin tam müstəqil olması başqa ölkələrdə bəzi dairələri qane etmirdi. Ermənistanın Azərbaycana etdiyi təcavüz və bunun nəticəsində Azərbaycanın zəifləməsi, məğlubiyyətə uğraması, ikinci tərəfdən də daxildə hakimiyyət çəkişməsi 1992-ci ilin iyun ayında hakimiyyətə gəlmiş qüvvələri bir ildən sonra hakimiyyətdən saldı, xalq özü saldı».**

Xalqımız **Heydər Əliyevin** ətrafında sıx birləşməklə gələcək taleyini özü həll etmək niyyətində idi. Azərbaycan torpaqlarının Ermənistan silahlı qüvvələri tərəfindən davamlı işğalı, getdikcə gərginləşən siyasi vəziyyət, əhalinin gündən-günə ağırlaşan sosial durumu ölkəni bu bəlalardan xilas edə biləcək, xalqı öz arxasınca aparmağa qadir liderə ehtiyac olduğunu şərtləndirirdi. **Ulu öndər** söyləyirdi ki: "Dövlət onun ərazisində yaşayan əhalinin təminatçısı olmalıdır". Cəmiyyətin bütün təbəqələri əmin idi ki, müstəqilliyini yenicə bərpa etmiş ölkəni düşdüyü ağır və dözülməz vəziyyətdən çıxarmağa qadir yeganə şəxsiyyət məhz **Heydər Əliyevdir**. Əslində, bu, bütün xalqın ürəyinin səsi idi. Xalqımız **Heydər Əliyevin** ətrafında sıx birləşməklə öz gələcək taleyini özü həll etmək niyyətində idi.

Beləliklə, 1993-cü il iyunun 9-da **Ulu öndər Heydər Əliyev**

xalqın çağırışına səs verərək Bakıya qayıtdı və Azərbaycan Xalq Cümhuriyyətinin taleyindən daha dəhşətli hadisələrin gözlənildiyi ölkəmizi bəlalardan, müsibətlərdən xilas etdi. Həmin gün, sözün həqiqi mənasında, ölkəmizin taleyində dönüş anı oldu, böyük qurtuluşa doğru mühüm addım atıldı. Xalqımızı nicata aparan yol bilavasitə həmin gündən başlandı. İyunun 15-də **Heydər Əliyev** Azərbaycan Ali Sovetinin sədri seçildi. **Ulu öndər** böyük risklərə baxmayaraq, xalqın qurtuluşu missiyasını cəsarətlə öz üzərinə götürdü.

**Heydər Əliyev** öz xilaskarlıq missiyası ilə ölkəmizin müstəqilliyini qorudu, respublikada tüğyan edən ictima-siyasi böhranı aradan qaldırdı və inkişafın təməlini qoydu. **«Mənim həyatım da, fəaliyyətim də yalnız və yalnız Azərbaycanın müstəqilliyinin qorunub saxlanmasına, ölkəmizin bu ağır vəziyyətdən qalxmasına həsr olunacaqdır»**, - deyən Ümummilli Lider problemlərin həlli üçün ölkədə vətəndaş həmrəyliyini, sabitliyi son dərəcə vacib sayırdı: **«Əgər respublikada ictimai-siyasi sabitlik olmasa, sağlam ictimai-siyasi mühit olmasa, heç bir sosial-iqtisadi proqramdan, yaxud problemlərin həll edilməsindən söhbət gedə bilməz». Heydər Əliyev** öz xilaskarlıq missiyası ilə ölkəmizin müstəqilliyini qorudu, respublikada tüğyan edən ictimai-siyasi böhranı aradan qaldırdı və inkişafın təməlini qoydu. Bununla da ölkədə uzun illər davam edən gərginlik və qarşıdurma səngidi, respublikamız vətəndaş müharibəsindən və parçalanma təhlükəsindən xilas oldu. Həmin il «olum, ya ölüm» ayrıcında qalmış Azərbaycan **Heydər Əliyevin** yorulmaz fəaliyyəti nəticəsində gələcəyə inamla baxan qüdrətli bir dövlətə çevrildi. **Ulu öndər** qeyd edirdi ki: "Əgər respublikada ictimai- siyasi mühit olmasa, heç bir sosial-iqtisadi prqramdan, yaxud problemlərin həll edilməsildən söhbət gedə bilməz". 1993-cü il oktyabrın 3-də Ümummilli Lider xalqımızın böyük əksəriyyəti tərəfindən ölkə **Prezident**i seçildi.

Milli qurtuluş ideologiyasının təntənəsi müstəqil respublikamızın davamlı inkişafında özünü büruzə verir, dünyada Azərbaycanın nüfuzu daha da artır. **Ulu öndər Heydər Əliyevin** hakimiyyətə qayıdışından sonra ölkədə baş vermiş sosial-iqtisadi və siyasi inkişaf dövlətimizin möhkəmlənməsində, sivil dünyaya sıx inteqrasiya prosesinə qoşulmasında və xalqımızın strateji mənafelərini təmin edən modern cəmiyyətin qurulmasında həlledici rol oynadı. Beləliklə, bu mühüm tarixi gün xalqımızın yaddaşına Milli Qurtuluş Günü



kimi həkk oldu və 1997-ci ildən etibarən parlamentin qərarı ilə rəsmi bayram kimi qeyd edilir.

AXC-Müsavat hakimiyyəti **Heydər Əliyevin** uğurlarını qısqanclıqla qarşılayıb ona mane olmağa çalışdı**.** Milli Məclisin 1993-cü il iyunun 15-də keçirilən iclasındakı çıxışında **Ulu öndər** Azərbaycan dövlətçiliyinin gələcək inkişaf strategiyasını elan etdi və sonrakı illərdə onu həyata keçirdi. Əgər müstəqilliyi qazanmaq ilkin şərt idisə, ikinci vacib məsələ onu qoruyub inkişaf etdirmək idi və bu, Ümummilli Liderin iradəsi sayəsində reallığa çevrildi. **Heydər Əliyev** milli dövlətçiliyimizin konsepsiyasını yaratdı. Bütün maneələrə baxmayaraq ən qısa müddətdə ölkədə ictimai-siyasi sabitlik bərpa olundu. AXC-Müsavat hakimiyyəti isə təbii ki, **Heydər Əliyevin** uğurlarını qısqanclıqla qarşılayıb ona mane

olmağa çalışdı. Vəziyyətdən səbirlə çıxan **Prezident Heydər Əliyev** televiziya vasitəsilə xalqa müraciət etdi. İyunun 20-də Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə çatdırılması məqsədilə yerli və xarici jurnalistlər üçün brifinq keçirdi. İyunun 21-də isə bir sıra ölkələrin diplomatları ilə görüşdü. **Ulu öndər** söylədiyi kimi: **"Azərbaycan dövlətinin daxili və xarici siyasəti xalqımızın iradəsinin beynəlxalq aləmdə təsdiqinə, qarşıda duran tarixi vəzifələrin dönmədən həyata keçirilməsinə xidmət edir"**. Bu baxımdan da bu sahədə yürüdülən siyasət respublikanı informasiya blokadasından çıxardı. Dünyada ölkəmizlə bağlı formalaşan fikir müsbət yönümdə dəyişdi. Məhz belə bir mürəkkəb siyasi şəraitdə **Heydər Əliyevin** böyük potensialı Azərbaycanın müstəqilliyinin qarantına çevrildi. Ümummilli Liderin şəxsiyyəti, onun özünəməxsus siyasi idarəetmə qabiliyyəti, xarizması, qətiyyəti, uzaqgörənliyi böhrana son qoydu, xalqımız Azərbaycan və azərbaycançılıq ideyaları ətrafında birləşdi. Ümummilli Liderin müdrikliyi və qətiyyəti sayəsində Azərbaycan müstəqil, demokratik, hüquqi və dünyəvi dövlət kimi inkişaf etməyə başladı. Respublikanın qarşısında duran problemlər mərhələlərlə həll olundu, əmin-amanlıq, siyasi sabitlik yarandı. İctimai-siyasi, sosial-iqtisadi, elmi və mədəni həyatda əsaslı dönüş başlandı, xalqımızın bütövlüyü, həmrəyliyi, milli birliyi təmin edildi. **Ulu öndər** bəyan edirdi ki: **"Böyük iftixar hissi ilə deyə bilərik ki biz artıq öz taleyimizin, öz ölkəmizin sahibiyik".**

**Heydər Əliyev** dühasının xidmətləri olan nailiyyətlər Azərbaycanı məhv olmaqdan qurtardı, müstəqilliyimizi daimi, əbədi, sarsılmaz, dönməz etdi. **Ulu öndər Heydər Əliyevin** həyata keçirdiyi təxirəsalınmaz sosial-iqtisadi, siyasi və mənəvi tədbirlərin nəticəsi kimi, bir tərəfdən Milli Ordunun formalaşdırılması, Azərbaycanın milli mənafelərini qorumağa qadir olan nizami silahlı qüvvələrin yaradılması, torpaqlarımızın müdafiə olunması ilə bağlı mühüm addımlar atılmağa başlandı, digər tərəfdən, bütün siyasi və diplomatik vasitələrin işə salınması ilə 1994-cü ilin may ayında həyati əhəmiyyət kəsb edən atəşkəs əldə edildi.

Atəşkəsin həyati əhəmiyyəti onda idi ki, məhz bu müqavilədən sonra ölkəmizin dünya birliyinə inteqrasiyası sürətləndi, öz iqtisadi potensialından səmərəli istifadə edərək dünya bazarına daxil olmağa şərait yaradan beynəlxalq müqavilələr, razılaşmalar və s. əldə edildi.

Ölkə daxilində yaranmış nisbi sabitlikdən, həmçinin beynəlxalq

aləmdə Azərbaycana münasibətdə artan inam və maraqdan istifadə edərək 1994-cü ilin sentyabrında «Əsrin müqaviləsi»nin imzalanması və onun gerçəkləşdirilməsi də məhz **Ulu öndər Heydər Əliyev** tərəfindən işlənib hazırlanan və müstəqil Azərbaycanın iqtisadi inkişaf konsepsiyasının əsasını təşkil edən neft strategiyasının həyata keçirilməsinin parlaq təzahürüdür. **Ulu öndər** nəzərə yetirirdi ki, **"Bizim iqtisadi siyasətimiz məlumdur və o, Azərbaycanda bazar iqtisadiyyatı yolu ilə getmək və bu yol ilə Azərbaycan iqtisadiyyatını dünya iqtisadiyyatına sıx surətdə bağlamaq məqsədi güdür".**

**Heydər Əliyevin** rəhbərliyi ilə respublikamız qədim İpək Yolunun bərpası, Bakı-Tbilisi-Ceyhan, Bakı-Tbilisi-Ərzurum neft və qaz xətlərinin çəkilişi kimi qlobal layihələrin fəal iştirakçısına və təşəbbüskarına çevrildi. Həyatın bütün sahələrində tərəqqi və dirçəliş baş verdi. **Heydər Əliyev** dühasının xidmətləri olan bu nailiyyətlər Azərbaycanı məhv olmaqdan qurtardı, müstəqilliyimizi daimi, əbədi, sarsılmaz, dönməz etdi. Bütün bunlar 1993-cü il 15 iyun tarixinin nailiyyətləridir.

**Heydər Əliyevin** xalqımız və tariximiz qarşısında ən böyük xidmətləri kəskin geosiyasi ziddiyyətlərin mövcud olduğu bir şəraitdə Azərbaycan dövlətçiliyini xilas etməsində, ölkəmizi parçalanıb yox olmaq təhlükəsindən qurtarmasında idi. Dövlətimizin qorunub saxlanması isə azadlığımızın, müstəqilliyimizin qorunub saxlanması, qurtuluş deməkdir.

15 iyun tarixi təkcə dövlətçiliyimizin xilası deyildi, bu tarix həm də Azərbaycanın bu gününü, sabahını müəyyənləşdirdi**. Ulu öndər Heydər Əliyev** Azərbaycanı qüdrətli, nüfuzlu, demokratik dövlət kimi görmək istəyirdi, onun hər addım və hərəkətləri məhz buna yönəlmişdi. Məhz Ümummilli Liderin uzaqgörən siyasəti nəticəsində 1995-ci ilin noyabrında demokratik, hüquqi dövlətin təməlini təşkil edən Konstitusiya qəbul olundu. Beləliklə, ölkədə daha geniş miqyaslı islahatların aparılması üçün normativ-hüquqi bazanın formalaşdırılmasına başlandı.



## HEYDƏR ƏLİYEV - TARİX YARADAN, TARİXİ YAZAN ŞƏXSİYYƏTDİR

Dünya tarixi sübut etmişdir ki, şəxsiyyətlərin gücü, ağlı, cəsarəti, siyasi iradəsi və müdrikliyi mənsub olduğu xalqın, onun yaratdığı dövlətin həyatında əvəzedilməz rola malikdir. Böyük alman filosofu Fridrix Nitşe yazırdı: «Şəxsiyyətləri tarix yaratmır, şəxsiyyət tarixi yaradır".

Azərbaycan tarixinin taleyüklü hadisələrlə dolu qırx illədək bir dövrü qüdrətli şəxsiyyət **Heydər Əliyevin** adı ilə bağlıdır. **Ulu öndərin** müdrik və uzaqgörən idarəçiliyi sayəsində Azərbaycan bu

gün xarici siyasətində etibar və sabitlik amili kimi çıxış edən, iqtisadi inkişaf və sosial rifah yolunda mətin addımlarla irəliləyən, demokratik təsisatların təşəkkül tapdığı müasir ölkədir. **Ulu öndər** söylədiyi kimi: **"Həyat mübarizədir. Respublikamızın həyatı daha çox mübarizlik tələb edir." Görkəmli dövlət xadimi Heydər Əliyevin Azərbaycana rəhbərliyi dövründə xalqın min illərlə arzusunda olduğu niyyətlər gerçəyə çevrilib, müstəqil Azərbaycanın davamlı inkişafı təmin edilib. Ulu öndər Heydər Əliyev ideyaları əbədi və dönməzdir. Və özü qeyd etdiyi kimi: "Mən hər bir kəsə tövsiyyə edirəm ki, göstərilən etimadı qiymətləndirsin, etimada sədaqətlə xidmət etsin"**.

**Ulu öndər** fitrən, doğuluşdan sanki addım-addım müdriklik dühasına doğru addımlayırdı. Xalq öz tarixi şəxsiyyətləri ilə fəxr edir, onların yaratdığı irsə böyük ehtiramla yanaşır. Müasir Azərbaycan dövlətinin qurucusu, xalqının və dövlətinin müstəqilliyi, inkişafı naminə çox böyük işlər görmüş, bununla bağlı tarixi proseslərə təsir göstərmiş **Heydər Əliyev** Azərbaycanı canı qədər sevən, ürəyi daim xalqının səadəti, xoşbəxtliyi uğrunda döyünən, ölkəsini azad, müstəqil və inkişafda görmək istəyən, vətəninin, xalqının yolunda həyatını qurban verməyə hazır olan **Heydər Əliyevin** mənalı ömür yolunun hər anı, hər səhifəsi bugünkü və gələcək nəsillərə nümunə olacaq canlı və unudulmaz Tarixdir. **Ulu öndərin** öz məntiqi ilə nəzərə yetirsək ki: **"Hər xalqın, Azərbaycan xalqının da öz milli mənliyi var. O milli mənliyi də xalqın qabaqda gedən adamları ifadə etməli, təmdil etməlidirlər."**

Azərbaycana rəhbərlik etdiyi ilk günlərdən etibarən mənsub olduğu xalqın tükənməz yaradıcılıq enerjisinin, milli müstəqillik duyğularının reallaşmasına çalışan Ümummilli Lider **Heydər Əliyev** xalqımızı dünyanın ən inkişaf etmiş xalqları səviyyəsinə çatdırmaq üçün əlindən gələni əsirgəməmişdir. **Heydər Əliyev** ölkə rəhbərliyində yüksək vəzifədə çalışarkən öz iti zəkası, yüksək erudisiyası, siyasi uzaqgörənliyi, yorulmaz fəaliyyəti ilə daim diqqət mərkəzində idi.



## XİLASKARLIQ MİSSİYASI

**Ulu öndərin** ikinci dəfə xalqın təkidli tələbi ilə ikinci dəfə siyasi hakimiyyətə gəlişi nəinki Azərbaycanı, bütöv bir xalqı məhv olmaq təhlükəsindən xilas etdi. Xalq ən ağır günlərini yaşadığı bir zamanda sevimli oğlunu, dahi şəxsiyyət **Heydər Əliyev**i ölkəni idarə etməyə çağırdı. Bu təkidli çağırışın arxasında sonsuz xalq etimadı, millətin məhəbbəti və inamı dayanırdı. Lakin onun birinci hakimiyyəti dövründəki abad Azərbaycandan heç nə qalmamışdı. **Ulu öndər demişdir ki: "Rəhbərlik etmək, yəni adamları öyrətmək və tərbiyələndirmək üçün gərək mənəvi haqqın olsun"**.

Ümummilli Liderin 1993-cü il iyunun 15-də Azərbaycanda siyasi hakimiyyətə xilaskar missiyalı qayıdışı xalqın milli dövlətçiliyinə və sabahkı gününə inamını özünə qaytardı, ölkə həyatının bütün sahələrinə nüfuz etmiş böhran aradan qaldırıldı, Qarabağ cəbhəsindəki uğursuzluqların qarşısı alındı, ictimai-siyasi sabitlik, milli-mənəvi həmrəylik və vətəndaş sülhü təmin edildi, ən başlıcası isə itirilməkdə olan dövlət müstəqilliyi qorunub saxlanıldı. Yaxın keçmişimizdə baş verən hadisələrə qiymət verməyi bacaran hər bir insan dərk edir ki, **Heydər Əliyev** qardaş qırğınının, vətəndaş müharibəsinin qarşısını almağa həyatını təhlükəyə atmaqla, ölümündən çəkinməyərək nail oldu. **Ulu öndər diqqətə çatdırırdı ki: "Azərbaycan xalqının ən**

**yüksək xüsusiyyətlərindən biri onun dözümlülüyü, dəyanətliliyi və iradəsidir."**

1993-cü il oktyabrın 3-də ümumxalq səsverməsi nəticəsində **Heydər Əliyev** Azərbaycan Respublikasının **Prezident**i seçildi. Ümummilli Liderin həyata keçirdiyi təxirəsalınmaz tədbirlər nəticəsində ölkəmiz müstəqilliyini itirmək, parçalanmaq, vətəndaş müharibəsi təhlükəsindən xilas oldu. 1994-cü ilin sentyabrında «Əsrin müqaviləsi» adlandırılan neft müqaviləsinin imzalanması müstəqil Azərbaycan dövlətinin beynəlxalq arenada strateji mahiyyət kəsb edən möhtəşəm qələbəsi idi.

1995-ci ildə müstəqil Azərbaycan Respublikasının ilk Konstitusiyası qəbul edildi. **Ulu öndərin** təşəbbüsü və rəhbərliyi ilə hazırlanan bu ali sənəd Azərbaycanda insan hüquq və azadlıqlarının qorunması və təmin olunmasında yeni mərhələ açdı.

1998-ci ildə şərqdə ilk dəfə olaraq Azərbaycanda ölüm hökmü ləğv olundu. **Heydər Əliyev** üçün müstəqil Azərbaycan fəlsəfəsinin təməlində azadlıq, demokratiya, iqtisadi tərəqqi, sosial ədalət və rifah dururdu. Hakimiyyətin bölünmə prinsipinin təsbit olunması, hüquq normalarının və qanunvericilik bazasının beynəlxalq standartlara uyğunlaşdırılması, müasir idarəetmə üsullarının bərqərar olması və müvafiq dövlət qurumlarının formalaşdırılması Ümummilli Liderin rəhbərliyi ilə gerçəkləşən genişmiqyaslı quruculuq proqramının tərkib hissələridir. Azərbaycanda müasir, demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu, vətəndaş cəmiyyətinin təşəkkülü, milli-mənəvi dəyərlərə qayıdış və elmin, təhsilin, mədəniyyətin inkişafı əbədi surətdə Dahi Şəxsiyyətin adı ilə bağlıdır. **Ulu öndər** söyləyirdi ki: **"Xalq gərək daim öz kökünü xatırlasın, tarixini öyrənsin, milli mədəniyyətindən, elmindən heç vaxt ayrılmasın"**.

1998-ci il oktyabrın 11-də **Ulu öndər** yenidən yekdilliklə Azərbaycan Respublikasının **Prezident**i seçildi. Bu, Ümummilli Liderə olan sonsuz etimadı, məhəbbəti, inamı bir daha sübut edirdi.

**Heydər Əliyevin** fəaliyyətinin 1993-2003-cü illəri bir ömrün qızıl salnaməsidir. **Ulu öndər** həmin dövrdə Azərbaycanı yalnız parçalanmaqdan, dövlət çevrilişlərindən, özbaşınalıqlardan xilas etmədi, həm də xalqımıza yeni, firavan, ildən-ilə gözəlləşən bir həyat, müstəqilliyi daha da möhkəmləndirilmiş Azərbaycanı bəxş etdi. Zaman **Heydər Əliyev** siyasətinin alternativsizliyini sübut etdi.



## AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİ - ŞƏRQDƏ İLK MÜSTƏQİL DÖVLƏT

Azərbaycan xalqının azadlıq və müstəqillik mübarizəsi tarixinə qızıl hərflərlə həkk olunan 1918-ci ilin may ayının 28-i,suveren dövlətimizin hər bir vətəndaşı tərəfindən qürur, şərəf, ləyaqət, azadlig günü kimi qəbul edilib. 44 gün davam edən tarixi Vətən müharibəsindən Qələbə ilə ayrılan Azərbaycan xalqı 28 May – Respublika Gününü ərazi bütövlüyü bərpa olunmuş formada qarşılayır. Artıq erməni işğalından azad edilən torpaqlarımızda da bu bayram qeyd olunur. Azərbaycan xalqı üçün 28 May-Respublika Gününün ərazi bütövlüyü bərpa olunmuş, torpaqları düşmən işğalından azad edilmiş və Cümhuriyyətin yadigarı olan şanlı bayrağının Şuşada, Ağdamda, Laçında və digər ərazilərimizdə dalğalandığı bir şəraitdə qeyd edilməsi heç bir müqayisəyə gəlməz böyüklükdə sevinc və qürurdur.

Müsəlman Şərqində ilk demokratik və parlamentli respublika olan Azərbaycan Xalq Cümhuriyyətinin yaranması azad ölkə, azad dövlət,



azad vətəndaş demək idi. Azərbaycan Xalq Cümhuriyyəti ölkəmizin çoxəsrlik sosial-iqtisadi, ictimai-siyasi və mədəni inkişafının, xalqımızın milli oyanışı və dirçəlişi proseslərinin məntiqi nəticəsi kimi meydana çıxmış və xalqımızın siyasi şüur səviyyəsinin, intellektual və mədəni potensialının, yüksək istedad və qabiliyyətinin göstəricisi idi.

Qədim və zəngin dövlətçilik ənənələrinə malik Azərbaycan xalqı keçmişinin müəyyən dövrlərində tarixin hökmü ilə böyük imperiyalar tərkibinə qatılmaq məcburiyyətində qalmışdır. Azərbaycan Xalq Cümhuriyyəti məhz dünyanın siyasi nizamının yenidən qurulduğu bir vaxtda, XIX əsrin axırları və XX əsrin əvvəllərində Azərbaycanın yaşadığı parlaq mədəni yüksəliş mərhələsinin məntiqi yekunu kimi meydana çıxmışdır. **Ulu öndər** diqqətə çatdırırdı ki: **"Əsrlər boyu xalqımız böyük tarixi yol keçibdir. Tariximizin hət səhifəsi bizimçün əzizdir. Şübhəsiz ki, yariximizin parlaq səhifələri də, qaranlıq səhifələri də var, təntənəli səhifələri də, faciəli sahifələri də var"**.

1918-ci il may ayının 28-də Azərbaycanın müstəqilliyini bəyan edən İstiqlal Bəyannaməsi qəbul edildi. Yeni qurulan Azərbaycan Xalq Cümhuriyyəti öz üzərinə götürdüyü çətin tarixi vəzifəni imkanlarının

ən son həddində çalışaraq şərəflə yerinə yetirdi.

Azərbaycanın ilk Parlamenti və Hökuməti, dövlət aparatı təşkil edildi:

- ölkənin sərhədləri müəyyənləşdirildi;
- bayrağı, himni və gerbi yaradıldı;
- ana dili dövlət dili elan edildi;
- dövlət quruculuğu sahəsində ciddi tədbirlər həyata keçirildi;
- ölkənin ərazi bütövlüyü və milli təhlükəsizliyi təmin edildi, qısa müddətdə yüksək döyüş qabiliyyətli hərbi hissələr yaradıldı, milli tələblərə və demokratik prinsiplərə uyğun dövlət orqanları quruldu, maarifin və mədəniyyətin inkişafına xüsusi diqqət yetirildi;
- azərbaycanın ilk universiteti təsis olundu, təhsil milliləşdirildi;
- xalqın mədəni yüksəlişi üçün zəmin hazırlayan, ictimai fikir tarixi baxımından müstəsna əhəmiyyətli işlər görüldü;
- Mövcudluğunun ilk günlərindən xalq hakimiyyəti və insanların bərabərliyi prinsiplərinə əsaslanan Azərbaycan Xalq Cümhuriyyəti bütün ölkə vətəndaşlarına eyni hüquqlar verərək irqi, milli, dini, sinfi bərabərsizliyi ortadan qaldırdı. Cümhuriyyət parlamentinin il yarımlıq fəaliyyəti boyunca qəbul etdiyi qanunlar milli dövlətin müstəqilliyinin möhkəmləndirilməsinə, siyasi və iqtisadi inkişafa, mədəniyyət və maarif sahələrində sürətli irəliləyişə imkan verdi. Azərbaycan Xalq Cümhuriyyəti daim sülhsevər siyasət apararaq bütün dövlətlərlə qarşılıqlı əməkdaşlıq əlaqələri yaratmağa və bir-birinin hüquqlarına hörmət prinsipləri əsasında münasibətlər qurmağa cəhd göstərirdi.

1920-ci ilin aprel ayındakı bolşevik işğalından sonra Azərbaycanın bir dövlət kimi dünyanın siyasi xəritəsindən silinməsinin qarşısını aldı.

1920-ci il 28 apreldə Azərbaycan Xalq Cümhuriyyəti təcavüzə məruz qaldığı üçün qarşıya qoyduğu məqsədlərə tam müvəffəq ola bilmədən süquta uğrasa da, onun şüurlarda bərqərar etdiyi müstəqillik ideyası unudulmadı. **Ulu öndər** tarixçi idi, tarixi sevir, çox mütaliə edirdi və söyləmişdi ki: **"1918-ci ildən yaranmış ilk azərbaycan Demokratik Cümhuriyyəti də bizim milli sərvətimizdir, tariximizin parlaq səhifələridir, xalqımızın böyük nailiyyətləridir. Məhs bunlar hamısı birlikdə indiki müstəqil Azərbaycanın həm iqtisadi, elmi, intellektual, həm də mədəni mədəni potensialını yaradıbdır".**

Azərbaycan xalqı ötən dövr ərzində milli dövlətçilik atributlarının bir çoxunu qoruyub saxlaya bildi. Ümummilli lider **Heydər Əliyevin**



respublikada uğurla gerçəkləşdirdiyi siyasət xalqımızın tarixi-mədəni yaddaşını özünə qaytararaq milli mənlik şüurunu inkişaf etdirdi, azərbaycançılıq məfkurəsi işığında müstəqillik arzularının güclənməsi və yaxın gələcəkdə yenidən həqiqətə çevrilməsinə zəmin yaratdı. 1991-ci ildə müstəqilliyinin bərpasına nail olarkən müasir Azərbaycan Respublikası özünün ənənəvi dövlətçilik ənənələrinə sadiq qaldığını göstərdi, Xalq Cümhuriyyətinin siyasi və mənəvi varisi olmaqla onun üçrəngli bayrağını, gerbini, himnini qəbul etdi.

Müasir müstəqil Azərbaycan dövlətinin qurucusu kimi milli dövlətçilik institutunu **Ulu öndər Heydər Əliyev** formalaşdırdı. Bütün mənalı həyatını öz xalqına bəxş edən **Ulu öndərin** qurucusu olduğu müstəqil Azərbaycan getdikcə daha da inkişaf edərək, qurucularının-istər Cumhuriyyətin, istərsə də hazırkı zamanın Liderlərinin adını əbədi yaşadacaq.

Təəssüf hissi ilə xatırlayırıq ki, 1991-ci ildə ikinci dəfə müstəqilliyini elan edən Azərbaycan hələ müstəqilliyinin ilk günlərindən bir çox bəlalarla üzləşmiş və ilk Respublika gününü torpaqlarının bir hissəsinin işğalı altında qeyd etmişdi. Əgər 1993-cü ildə Ümumilli lider **Heydər Əliyev** xalqın təkidli tələbi ilə ikinci dəfə hakimiyyətə qayıtmasaydı şübhə yoxdur ki, bu işğal daha da genişlənəcək,

ölkə daxilində vətəndaş müharibəsi ən yüksək səviyyəyə çatacaq, ölkəmizin müstəqilliyi şübhə altına düşəcəkdi. Azərbaycan xalqı şanslı xalqdır ki, onun **Heydər Əliyev** kimi lideri və xilaskarı var. **Heydər Əliyev** hakimiyyətə qayıtdıqdan qısa bir müddət sonra ölkədə daxili sabitliyin təmin olunması istiqamətində təsirli tədbirlər gördü, atəşkəs müqaviləsinin imzalanmasına nail oldu və dərhal iqtisadiyyatın gücləndirilməsi, ölkənin içinə düşdüyü informasiya blokadasının yarılması istiqamətində ardıcıl addımlar atdı. **Heydər Əliyevin** düşünülmüş siyasəti Azərbaycanın gələcəyinin təmin olunmasında birbaşa rol oynadı. **Ulu öndər** nəzərə yetirirdi ki: **"Əgər XX əsrin əvvəlində xalqımız milli azadlıq, dövlət müstəqilliyi yolunda ilk dəfə böyük addım atıbsa XX əsrin sonunda çmilli azadlığa, dövlət müstəqilliyinə tam nail olubdur"**.

**Ulu öndər Heydər Əliyev** yolu onun layiqli davamçısı, siyasi varisi İlham Əliyev tərəfindən uğurla davam etdirilir. **Prezident** İlham Əliyevin Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinin keçirilməsi ilə bağlı sərəncamı və 2018-ci ilin ölkəmizdə "Azərbaycan Xalq Cümhuriyyəti" ili elan olunması varislik ənənələrinə və müstəqil dövlət ideyalarına sədaqətin əyani ifadəsidir.

Dövlət başçısı İlham Əliyev AXC-nin 100 illik yubileyi zamanı demişdir: **"Yüz il bundan əvvəl müsəlman aləmində ilk dəfə olaraq demokratik respublika yaranmışdır. Biz fəxr edirik ki, bu respublikanı Azərbaycan xalqı yaradıb və bir daha bütün dünyaya nümayiş etdirib ki, Azərbaycan xalqı böyük xalqdır, istedadlı xalqdır, azad xalqdır. Azərbaycan Xalq Cümhuriyyətinin yaranması və iki il ərzində fəaliyyəti tarixi hadisə idi. Azərbaycan o ölkədir ki, hələ yüz il bundan əvvəl ən ülvi demokratik dəyərləri nəinki bəyan edib, öz praktiki fəaliyyətində onları təmin edib. Bugünkü Azərbaycan müstəqil Azərbaycan Xalq Cümhuriyyətinin varisidir. Azərbaycan Xalq Cümhuriyyətinin bütün demokratik dəyərlərinə sadiq olmasının bariz nümunəsidir"**.

## AZƏRBAYCAN HƏQİQƏTLƏRİ: TARİX, REALLIQ VƏ TƏCRÜBƏ 31 MART TARİXİ AZƏRBAYCAN XALQININ UNUDULMAZ QANLI SƏHİFƏLƏRİNDƏNDİR

***Mənfur qonşu ermənilərin tarixlər boyu azərbaycanlılara qarşı törətdikləri vəhşiliklərinin sübutlarıdır və söz yox ki, bütün bu qanlı əməllərinə görə həm tarix, həm də beynəlxalq hüquq qarşısında cavab verməli olacaqlar.***

Azərbaycan Respublikası müstəqillik qazandıqdan sonra xalqın tarixi keçmişinin obyektiv mənzərəsini yaratmaq imkanı əldə edilmişdir. Uzun illər gizli saxlanılan, üzərinə qadağa qoyulmuş həqiqətlər açılır, təhrif edilmiş hadisələr özünün əsl qiymətini alır.

Azərbaycan xalqına qarşı dəfələrlə törədilmiş və uzun illərdən bəri öz siyasi hüquqi qiymətini almamış soyqırım da tarixin açılmamış səhifələrindən biridir. **Ulu öndər** bildirirdi ki: "Əsrin əvvəlinə (XX əsr) nəzər salsaq, o vaxtdan başlayan proseslər milli azadlığa, müstəqilliyə yönəldilmiş proseslər ancaq və ancaq XX əsrin sonunda müəyyən qədər məqsədə yetmək səviyyəsinə gəlib çatmışdır".

1813-cü və 1828-ci illərdə imzalanan Gülüstan və Türkmənçay müqavilələri Azərbaycan xalqının parçalanmasının, tarixi torpaqlarımızın bölünməsinin əsasını qoydu. Azərbaycan xalqının bu milli faciəsinin davamı kimi onun torpaqlarının zəbti başlandı. Qısa bir müddətdə bu siyasət gerçəkləşdirilərək ermənilərin kütləvi surətdə Azərbaycan torpaqlarına köçürülməsi həyata keçirildi. Soyqırım Azərbaycan torpaqlarının işğalının ayrılmaz bir hissəsinə çevrildi.

İrəvan, Naxçıvan və Qarabağ xanlıqlarının ərazilərində məskunlaşan ermənilər orada yaşayan azərbaycanlılarla müqayisədə azlıq təşkil etmələrinə baxmayaraq, öz havadarlarının himayəsi altında «erməni vilayəti» adlandırılan inzibati bölgünün yaradılmasına nail oldular. Belə süni ərazi bölgüsü ilə, əslində, azərbaycanlıların öz torpaqlarından qovulması və məhv edilməsi

siyasətinin bünövrəsi qoyuldu. «Böyük Ermənistan» ideyaları təbliğ olunmağa başlandı. Bu uydurma dövlətin Azərbaycan torpaqlarında yaradılmasına «bəraət qazandırmaq məqsədilə» erməni xalqının tarixinin saxtalaşdırılmasına yönəlmiş genişmiqyaslı proqramlar reallaşdırıldı. Azərbaycanın və ümumən Qafqazın tarixinin təhrif

olunması həmin proqramların mühüm tərkib hissəsini təşkil edirdi.

«Böyük Ermənistan» yaratmaq xülyasından ruhlanan erməni qəsbkarları 1905-1907-ci illərdə azərbaycanlılara qarşı açıq şəkildə genişmiqyaslı qanlı aksiyalar həyata keçirdilər. Ermənilərin Bakıdan başlanan vəhşilikləri Azərbaycanı və indiki Ermənistan ərazisindəki Azərbaycan kəndlərini əhatə etdi. Yüzlərlə yaşayış məntəqəsi dağıdılıb yerlə-yeksan edildi, minlərlə azərbaycanlı vəhşicəsinə qətlə yetirildi. Bu hadisələrin təşkilatçıları məsələnin mahiyyətinin açılmasına, ona düzgün hüquqi-siyasi qiymət verilməsinə maneçilik törədərək azərbaycanlıların mənfi obrazını yaratmış, özlərinin avantürist torpaq iddialarını pərdələmişlər.

Azərbaycanlıların soyqırımı Bakı, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda, Lənkəranda və Azərbaycanın başqa bölgələrində xüsusi qəddarlıqla həyata keçirilmişdir. Bu ərazilərdə dinc əhali kütləvi surətdə qətlə yetirilmiş, kəndlər yandırılmış, milli mədəniyyət abidələri dağıdılıb məhv edilmişdir. **Ulu öndər** proseslərə nəzər yetirərək demişdir: **"20-ci illərin (XX əsr nəzərdə tutulur), 30-cu illərin represiyaları, (soyqırımları) on minlərlə insan həyatını məhv etmişdir. On minlərlə azərbaycanlı öz yurdlarından uzaq yerlərə sürgün olunmuşdur. Onların hüquqları pozulmuş, var-yoxları əllərindən alınmışdır".**

1988-ci ildən ortaya atılan Qarabağ münaqişəsinin ilkin mərhələsində yüz minlərlə azərbaycanlının öz tarixi torpaqlarından qovulmasına da respublikada düzgün siyasi qiymət verilmədi. Azərbaycanın Dağlıq Qarabağ Muxtar Vilayətinin Ermənistan SSR-in tərkibinə daxil edilməsi haqqında ermənilərin qeyri-konstitusion qərarını və Moskvanın, əslində, bu vilayəti Xüsusi İdarəetmə Komitəsi vasitəsilə Azərbaycanın tabeliyindən çıxarmasını xalqımız ciddi narazılıqla qarşıladı və mühüm siyasi aksiyalara əl atmaq məcburiyyəti qarşısında qaldı. Respublikada keçirilən mitinqlər zamanı torpaqlarımızın işğalı siyasəti qətiyyətlə pislənsə də, Azərbaycan rəhbərliyi öz passiv mövqeyindən əl çəkmədi. Məhz elə bunun nəticəsi olaraq 1990-cı ilin yanvar ayında getdikcə güclənən xalq hərəkatını boğmaq məqsədi ilə Bakıya qoşunlar yeridildi, yüzlərlə azərbaycanlı məhv və şikəst edildi, yaralandı, digər fiziki təzyiqlərə məruz qoyuldu. **Ulu öndər Heydər Əliyev** söylədiyi kimi: **"20 yanvar hadisəsinin tariximizdəki yeri, qiyməti ayrı-ayrı insanların taleyi ilə məhdudlaşa bilməz. Bu ayrı-**

**ayrı insanların deyil bütöv bir xalqın taleyidir".**

1992-ci ilin fevralında ermənilər Xocalı şəhərinin əhalisinə misli görünməyən divan tutdu. Tariximizə Xocalı soyqırımı kimi həkk olunan bu qanlı faciə minlərlə azərbaycanlının məhv edilməsi, əsir alınması, şəhərin yerlə-yeksan edilməsi ilə qurtardı.

Millətçi-separatçı ermənilərin Dağlıq Qarabağda başladığı avantürist hərəkatın nəticəsi olaraq bu gün bir milyondan artıq soydaşımız erməni qəsbkarları tərəfindən öz doğma yurd-yuvalarından didərgin salınmış, çadırlarda yaşamağa məhkum edilmişdir. Ərazimizin 20%-nin erməni silahlı qüvvələri tərəfindən işğalı zamanı minlərlə vətəndaşımız şəhid olmuş, xəsarət almışdır.

Tarixin səhifələri vərəqləndikcə yeni-yeni faktlar, erməni vəhşiliyinin tükürpədən səhnələri üzə çıxır. Son vaxtlar məlumatların dəqiqləşdirilməsi istiqamətində axtarışlar genişləndirilir. Təkzibolunmaz arxiv sənədləri, soyqırımlarını təsdiqləyən çoxsaylı dəlil-sübutlar aşkarlanır.

Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra xalqımızın tarixi keçmişinin obyektiv mənzərəsini ortaya qoymaq imkanı yarandı. İndi uzun illər gizli saxlanılan, üzərinə qadağa qoyulmuş həqiqətlər bir-bir açılır. **Ulu öndər Heydər Əliyevin** "Azərbaycanlıların soyqırımı haqqında" 1998-ci il 26 mart tarixli Fərmanı ilə soyqırımı aktlarına siyasi-hüquqi qiymət verilməsi bu sahədə aparılan tədqiqatlara, həqiqətin üzə çıxarılması istiqamətində səylərin artırılmasına təkan verdi. Azərbaycan xalqına qarşı törədilmiş bütün soyqırımı faciələrini qeyd etmək məqsədilə 31 mart Azərbaycanlıların Soyqırımı Günü elan edildi.

**Ulu öndər Heydər Əliyevin** tarixi Fərmanından ötən illər ərzində aparılmış araşdırmalar sayəsində bir çox yeni faktlar və sənədlər toplanıb, Quba şəhərində kütləvi məzarlıq aşkarlanıb. Üzə çıxmış tarixi faktlar 1918-ci ilin mart-aprel aylarında və sonrakı dövrlərdə erməni millətçilərinin həyata keçirdikləri qanlı aksiyaların coğrafiyasının daha geniş və faciə qurbanlarının sayının qat-qat çox olduğunu sübuta yetirir.

**Prezident** İlham Əliyevin 2018-ci il yanvarın 28-də imzaladığı Sərəncama əsasən, 1918-ci il azərbaycanlıların soyqırımının 100 illiyi təkcə Azərbaycanda deyil, dünyanın bir çox guşələrində yaşayan həmvətənlərimiz, diaspor təşkilatları, xaricdəki səfirliklərimiz tərəfindən geniş qeyd olunub.



Xocalı haqqında həqiqətlərin dünyaya çatdırılması, bu faciənin xalqımıza qarşı soyqırımı aktı kimi tanınması üçün Azərbaycan dövləti bütün zəruri addımları atır. Bu sahədə məqsədyönlü fəaliyyət ümummilli lider **Heydər Əliyev** Azərbaycanda siyasi hakimiyyətə qayıdandan sonra başlanıb. **Ulu öndərin** təşəbbüsü ilə Xocalı soyqırımına siyasi-hüquqi qiymət verilib, fevralın 26-sı Xocalı Soyqırımı Günü elan edilib.

Azərbaycanın birinci vitse-**prezidenti**, xanım **Mehriban Əliyevanın** da əməyi barədə çoxsaylı fikirləri söyləmək olar. Məhz onun böyük zəhmətləri hesabına dünya ictimaiyyəti istər 1918-ci ildə, istərsə də sonrakı dövrlərdə erməni terrorunun gerçək tərəfi ilə məlumatlandırılıb. Beynəlxalq tədbir və simpoziumlarda, konfranslarda Azərbaycan xalqının haqq səsi bəşəriyyətə çatdırılıb. **Birinci vitse-prezidenti**, xanım **Mehriban Əliyeva** 20 yanvarla əlaqədar 2021-ci il "instagram" səhifəsində yazıb ki: **"Xalqımızın azadlığı uğrunda həlak olmuş həmvətənlərimizin – 20 yanvar facisəinin günahsız qurbanlarının əziz xatirəsinə ehtiramla yad edirik".**



2008-ci ildə **Heydər Əliyev** Fondunun vitse-**prezidenti** Leyla Əliyevanın təşəbbüsü ilə başlanmış “Xocalıya ədalət!” beynəlxalq kampaniyası isə bu istiqamətdə təbliğat işində xüsusi mərhələ təşkil edir. Faciə ilə əlaqədar dəhşətli faktlar bu kampaniya çərçivəsində geniş beynəlxalq ictimaiyyətə çatdırılır, planetin bütün guşələrində milyonlarla insan erməni millətçilərinin əsl simasına bələd olur, Xocalı faciəsini soyqırımı kimi tanıyan dövlətlərin, beynəlxalq təşkilatların sayı getdikcə artır. Təkcə bir faktı qeyd etmək kifayətdir ki, ABŞ-ın iyirmidən çox ştatının icra və qanunvericilik orqanları Xocalı faciəsini qətliam kimi qiymətləndirərək qətiyyətlə pisləyiblər.

2020-ci il 10 noyabrdan torpaqlarımız düşmən barbarlığından azad edilib və 44 günlük Zəfər yürüşündən sonra erməni vəhşiliklərinin də ifşası davam edir. Azad edilmiş torpaqlarımızda kütləvi məzarlıqlar aşkarlanır və Birinci Qarabağ müharibəsində erməni terrorçuları tərəfindən qətlə yetirilmiş vətəndaşlarımızın qalıqları tapılır. Bütün bunlar isə əlbəttə ki, ermənilərin tarixlər boyu azərbaycanlılara qarşı törətdikləri vəhşiliklərinin sübutlarıdır və söz yox ki, bütün bu qanlı

əməllərinə görə həm tarix, həm də beynəlxalq hüquq qarşısında cavab verməli olacaqlar.

**20 Yanvar 1990-cı il Azərbaycan xalqının həyatında dönüş - milli oyanış nöqtəsi oldu.**

Azərbaycanın müxtəlif ərazilərində, paytaxt Bakıda Qanlı Yanvar faciəsi, onun ağrı-acıları hər zaman qəlbimizi göynədir, qırmızı qərənfillərə bürünmüş şəhid cənazələrini çiyinlərində aparan insan seli, izdiham hər zaman sənədli filmlərdədir. Xalqın qan yaddaşına yazılan 20 Yanvar faciəsi zaman etibarilə uzaqlaşsa da, sanki dünən baş verib. O gecə Azərbaycan-Bakı qan içində boğuldu. Azərbaycan yenə faciəyə düçar edildi - Xalqımızın haqq səsini boğmaq istəyən o zamankı Kreml rəhbərləri 1990-cı il yanvarın 19-dan 20-ə keçən gecə - o qanlı şənbə gecəsi imperiya silahlarından əliyalın, silahsız millətimizin üzərinə güllə yağmuru yağdıraraq Bakıda Qanlı Yanvar qırğınını törətdi. Əksəriyyəti ermənilərdən ibarət olan keçmiş Sovet ordusunun törətdiyi qətl və cinayətlər yanvarın 20-dən sonra da davam etdi.

Müdrik bir məsəl var: **"Tarixini bilməyənlər onu yenidən yaşamağa məhkumdurlar".** Həmin müdhiş yanvar gecəsindən illər ötüb. 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə, saat 23.30 radələrində keçmiş Sovet İttifaqının müxtəlif təyinatlı qoşun hissələri fövqəladə vəziyyət elan etmədən qəflətən Bakı şəhərinə yeridilərək, küçə və meydanlarda toplaşan dinc əhaliyə amansızcasına divan tutmağa başladı. Nəticədə yüzlərlə dinc və əliyalın insan qətlə yetirildi, yaralandı və itkin düşdü. Fövqəladə vəziyyətin tətbiqi haqqında məlumat əhaliyə elan olunanadək hərbçilər gecə ərzində Bakıda 82 nəfəri amansızcasına qətlə yetirdi, 20 nəfəri ölümcül yaraladı. Fövqəladə vəziyyət elan edildikdən sonra isə - yanvarı 20-də və sonrakı günlər şəhərdə daha 21 nəfər qətlə yetirildi. Fövqəladə vəziyyət tətbiq olunmayan rayonlarda belə həmin günlərdə – yanvarın 25-də Neftçalada və yanvarın 26-da Lənkəranda 8 nəfər dinc sakin qətlə yetirilmişdir.

Keçmiş Sofet İttifaqının rəhbəri, bu qırğınların törədicisi M.Qorbaçovun ən yaxın məsləhətçilərindən biri olan akademik A.Aqanbekyanın hələ 1987-ci ilin noyabrın ortalarında Fransanın erməni institutu assosiasiyasının üzvləri ilə görüşərkən guya Qarabağın qədim erməni torpağı olduğunu iddia etməsi qanlı faciələrə başlamaq üçün bir siqnal idi. M.Qorbaçova yaxın olan Brutens, Şahnazarov, Sitaryan, Xaçaturov və digər qatı şovinist erməni emissarlarının Qarabağı

Azərbaycandan qoparmaq üçün sonadək mübarizə aparacaqları xarici dövlətlərə və oradakı kəşfiyyat orqanlarına yaxşı məlum idi. Qorbaçov özü də artıq ermənilərin dirijor çubuğu ilə durub-oturmaqla ölkəni «idarə edirdi.»

Xatırladaq ki, o vaxt daşnak Zori Balayanın xalqımıza qarşı böhtan və iftiralarla dolu «Ocaq» kitabı Qorbaçovun stolüstü kitabına çevrilmişdi. Məhz ermənipərəst Qorbaçovun xeyir-duasından sonra vəhşi daşnaklar Azərbaycana doğru yürüşə başladılar. 20 Yanvardan sonra baş verən faciələr sırasına dünyanın ən dəhşətli hadisələrindən biri Xocalı soyqırımı, Şuşa, Laçın, Kəlbəcər, Ağdam, Qubadlı, Zəngilan, Cəbrayıl, Füzuli və Qarabağın bəzi ərazilərində baş verən qanlı səhifələr də əlavə olundu. Vəhşi imperiyanın təpədən-dırnağadək silahlandırdığı erməni faşizmi ilə qeyri-bərabər döyüşlərdə 30 minə yaxın qəhrəman, mərd oğullarımızı itirdik. Ərazilərimizin 20 faizi işğal olundu, 1 milyondan artıq yurddaşımız öz doğma ata-baba torpağından didərgin düşdü.

1990-cı il yanvarın 21-də **Ulu öndər Heydər Əliyevin** bu hadisədə əli olanların əleyhinə kəskin bəyanatı milli azadlıq hərəkatının başlanmasına ciddi təkan oldu.20 Yanvarda qanla boğulmuş və qismən əzilmiş xalq hərəkatının yenidən dirçəlişi və milli azadlıq mübarizəsi mərhələsinə keçməsi o zaman Mixail Qorbaçov və ermənipərəst ətrafının səyi ilə SSRİ rəhbərliyindən istefaya göndərilən və xüsusi təzyiq altında Moskvada yaşayan **Heydər Əliyevin** bu prosesə fəal qoşulmasından sonra xüsusi vüsət aldı. Onun 1990-cı il yanvarın 21-də Moskvada Azərbaycanın Daimi Nümayəndəliyinə gələrək, bu hadisədə əli olanların əleyhinə kəskin bəyanat səsləndirməsi, kütləvi qırğının səbəbkarı kimi SSRİ və Azərbaycanın yerli rəhbərlərini qətiyyətlə ittiham etməsi xalq hərəkatına yeni nəfəs və istiqamət verdi. Bu aksiyanın ardınca, **Heydər Əliyevin** heç bir hədə-qorxu və təxribatlardan qorxmayaraq, 1990-cı il iyulun 20-də Vətənə qayıtması Azərbaycanda müstəqillik uğrunda xalq hərəkatının, başqa sözlə, sistemli milli azadlıq hərəkatının başlanmasına ciddi təkan oldu. Sözsüz ki, o zaman Azərbaycana rəhbərlik edənlər – Azərbaycan KP MK-nın birinci katibi Ə.Vəzirov, ikinci katib V.Polyaniçko və digərləri, dövrün siyasi müxalifəti sayılan və proseslərdə birbaşa iştirak edən AXC İdarə Heyəti 20 Yanvar faciəsində bu və ya digər formada siyasi və mənəvi məsuliyyət daşıyırdılar, ancaq bu qanlı əməliyyat birbaşa

Kreml, Qorbaçov və onun xaricdən qısqırdılan erməni əlaltıları tərəfindən planlaşdırılmış, imperiya mərkəzinin göndərdiyi emissarlar tərəfindən zəmin hazırlanmış və SSRİ müdafiə və daxili işlər nazirləri Yazov və Bakatinin komandanlıqları altında həyata keçirilmişdi.Məhz **Ulu öndər Heydər Əliyevin** 20 Yanvardan sonra Moskvadakı məlum çıxışı, azərbaycanlıların qanını tökmüş imperiya yetkililərini ciddi ifşa etməsi müstəsna rol oynadı. Həmin çıxış o vaxtadək gözləmə mövqeyində olan Azərbaycan ziyalılarını da hərəkətə gətirdi və müstəqillik çağırışları Azərbaycanda getdikcə daha geniş kütlə arasında səslənməyə başladı. Beləliklə, 20 yanvardan sonra Xalq hərəkatı Milli-azadlıq, İstiqlal hərəkatına çevrildi. **Ulu öndər** söylədiyi kimi: **"Bir şey həqiqətdir ki, 1990-cı ilin 20 yanvarı Azərbaycan xalqının həyatında dönüş mərhələsi, dönüş nöqtəsi olmuşdur. Həmin gün tariximizə qara gün kimi daxil olmuşdur"**.

**Ulu öndər Heydər Əliyevin** 1993-cü il 15 iyun qayıdışı Azərbaycanı sonrakı labüd iflasdan xilas etdiyi tarix

Onun qayıdışı ilə ölkənin bütün sağlam qüvvələri, ictimai-siyasi və mənəvi potensialı hakimiyyətin ətrafında səfərbər olaraq Azərbaycanı sonrakı labüd iflasdan xilas etdilər. Ümummilli lider **Heydər Əliyev** xalqın arzusu və tələbi ilə Azərbaycana ikinci dəfə rəhbərlik etməyə qayıtdıqdan cəmi bir neçə ay sonra, 1994-cü il yanvar ayının 5-də 20 Yanvar faciəsinin dördüncü ildönümünün keçirilməsi ilə bağlı Fərman imzaladı. Fərmanda Milli Məclisə faciəyə tam siyasi-hüquqi qiymət verməsi tövsiyə olunurdu. Bunun ardınca isə 1994-cü il yanvarın 12-də dövlət komissiyasının geniş iclasında çıxış edən **Ulu öndər** Azərbaycan Respublikası Ali Soveti Milli Şurasının 1992-ci il 19 yanvar tarixli qərarını xatırladaraq, bu qərarda 20 Yanvar hadisələrinin əsl səbəblərinin açıqlanmadığını, həqiqi günahkarların aşkar edilmədiyini, iki il ərzində həmin qərarın özünü doğrultmadığını diqqətə çatdırdı. 1994-cü il yanvar ayının 5-də **Ulu öndər Heydər Əliyevin** müvafiq Fərmanı ilə Milli Məclisin müzakirəsinə təqdim olunan 20 Yanvar faciəsinə siyasi-hüquqi qiymət verilməsi haqqında sənəd həmin ilin mart ayında **Prezident**in özü tərəfindən təsdiqlənərək, Azərbaycan xalqının öz haqqını tələb edə bildiyini, ona qarşı cinayət törətmiş caniləri mühakimə etməyi bacardığını bir daha sübut etmiş oldu. 1994-cü il mart ayının 29-da ümummilli lider **Heydər Əliyevin** gərgin əməyinin nəticəsi olaraq "1990-cı il yanvarın 20-də Bakıda törədilmiş



faciəli hadisələr haqqında" adlı xüsusi qərar qəbul edildi. Bununla da Azərbaycan xalqının məruz qaldığı dəhşətli faciəyə – 20 Yanvar hadisələrinə siyasi-hüquqi qiymət verilmiş oldu.

Baş verən hadisələrdən 33 il keçsə də bu gün fəxarətlə deyə bilərik ki, Azərbaycan xalqı müstəqilliyimiz və ərazi bütövlüyümüz uğrunda canından keçən bütün qəhrəman övladlarının qanını yerdə qoymadı. Artıq 3 ildir ki, Azərbaycan dünyaya bir daha göstərdi ki, bu xalq, bu dövlət bu ordu güclüdür, hər şeyə qadirdir. Son 3 il öncə - 2020-ci ildə ümumilli lider **Heydər Əliyevin** layiqli və uğurlu davamçısı **Ali Baş Komandan**, Qalib Sərkərdə, **Prezident** İlham Əliyevin «Dəmir yumruq» əməliyyatı ilə 44 gün ərzində 30 il ərzində Azərbaycan dövləti on illərdir ki, beynəlxalq qurumların- BMT, ATƏT və s. kimi təşkilatların "sülhyaratma dəhlizlərində" düyünə salınmış Dağlıq Qarabağ münaqişəsi və işğal problemini həll edərək erməni işğalı altında tapdanan tarixi torpaqlarımızın və yüzlərlə yaşayış məskənlərimizin geri qaytarılmasına nail oldu. İkinci Qarabağ müharibəsi **Prezident**



İlham Əliyevin qətiyyətli rəhbərliyi altında, eynən 20 Yanvarda olduğu kimi, bir daha bütün dünyaya Azərbaycan xalqının dəmir iradəsi və qələbə əzmini, lazımi anda öz dövləti ətrafında birləşmək bacarığını və Vətən üçün canını qurban vermək iradəsini nümayiş etdirdi. Bir sözlə, müharibəsində ordumuz torpaqlarımızı işğaldan azad etdi, şəhidlərimizin qanı yerdə qalmadı, Azərbaycan böyük tarixi qələbə qazandı.

Ölkə **Prezident**inin də dediyi kimi: **"Azərbaycan xalqı öz böyüklüyünü göstərdi, yüksək mənəvi ruhunu göstərdi. Bu Qələbənin səbəbkarı da Azərbaycan xalqıdır. Biz birlik, iradə, əzmkarlıq, milli ruh göstərərək tarixi missiyamızı yerinə yetirdik".**

«**Heydər Əliyev** İli»ndə biz çoxəsrlik Azərbaycan xalqının tarixinin şanlı səhifələrini qürurla yaşamaqdayıq. Çünki qəhrəman şəhidlərimizin fədakarlığı nəticəsində xalqımız azadlıq arzusuna qovuşub. Qarabağımız məhz şəhidlərimizin canı-qanı bahasına işğaldan azad edilib. Bu gün Şuşada, Füzulidə, Cəbrayılda, Zəngilanda, Qubadlıda, Ağdamda, Kəlbəcərdə, Laçında Azərbaycanın dövlət bayrağı qürurla dalğalanır. Biz buna görə rəşadətli Ordumuza, **Müzəffər Ali Baş Komandan**ımıza, Azərbaycan əsgərinə, qəhrəman şəhidlərimizə borcluyuq.



## MÜDRİKLİK ZİRVƏSİ - AZƏRBAYCAN XALQININ ƏBƏDİLƏŞMİŞ LİDERİ

**Ulu öndər** söyləyirdi ki: **"Biz yaşadığımız uzun bir dövrü silib-poza bilmərik... Xalq gərək daim öz kökünü xatırlasın, tarixini öyrənsin"**.

Dekabrın 12-si xalqımızın Ümummilli Lideri, çoxəsrlik Azərbaycan tarixində misilsiz xidmətləri ilə əbədiyaşar mövqe qazanmış **Ulu öndər Heydər Əliyevin** anım günüdür. Dünya tarixi sübut etmişdir ki, şəxsiyyətlərin gücü, ağlı, cəsarəti, siyasi iradəsi və müdrikliyi mənsub olduğu xalqın, onun formalaşdırdığı dövlətin həyatında əvəzedilməz rola malikdir. **Ulu öndər Heydər Əliyevin** əbədiyyətə qovuşmasından illər ötsə də, O, bu gün də, gələcəkdə də Azərbaycan xalqının qəlbində yaşayacaq, yaşadılacaq. Çünki öz müqəddəs əməli sayəsində Vətəni, xalqı uğrunda yorulmadan çalışmış Dahi Şəxsiyyət, Fenomen İnsan **Heydər Əliyev** ömrünü dövlətçiliyin inkişafı, Azərbaycanın tərəqqisi üçün şam kimi əritdi. Onun bir amalı var idi - qurduğu mütərəqqi dövləti beynəlxalq aləmdə tanıtmaq, lider ölkələrdən birinə çevirmək. Və bu amal gerçəkliyə çevrilib.



**Müdrikliyin dühası** - Hər bir xalq öz tarixi şəxsiyyətləri ilə fəxr edir, onların yaratdığı irsə böyük ehtiramla yanaşır. Müasir Azərbaycan dövlətinin memarı və qurucusu, xalqının və dövlətinin müstəqilliyi, inkişafı naminə çox böyük işlər görmüş, bununla bağlı tarixi proseslərə təsir göstərmiş **Heydər Əliyev** hər zaman iftixar hissi ilə xatırlayacağımız dahi şəxsiyyətdir. **"Mən demokratiya tərəfdarıyam"** söyləyən **Ulu öndər** Azərbaycanı canı qədər sevən, ürəyi daim xalqının səadəti, xoşbəxtliyi uğrunda döyünən, ölkəsini azad, müstəqil və inkişafda görmək istəyən, vətəninin, xalqının yolunda həyatını qurban verməyə hazır olan **Heydər Əliyevin** mənalı ömür yolunun hər anı, hər səhifəsi bugünkü və gələcək nəsillərə nümunə olacaq canlı və unudulmaz tarixdir. Azərbaycana rəhbərlik etdiyi ilk günlərdən etibarən mənsub olduğu xalqın tükənməz yaradıcılıq enerjisinin, milli müstəqillik duyğularının reallaşmasına çalışan Ümummilli Lider **Heydər Əliyev** xalqımızı dünyanın ən inkişaf etmiş xalqları səviyyəsinə çatdırmaq üçün əlindən gələni əsirgəməmişdir.



**Heydər Əliyev** birinci dəfə respublika rəhbərliyinə gələrkən sosial-iqtisadi böhran keçirən Azərbaycanı keçmiş İttifaqın ən qabaqcıl respublikalarından biri səviyyəsinə qaldırmışdır. Ümummilli Liderin Azərbaycanda siyasi hakimiyyətə gəlişini tarixi hadisə kimi qiymətləndirənlər öz qənaətlərində haqlıdırlar. Çünki rəhbər vəzifədə olduğu müddətdə respublikada köklü dəyişikliklər baş vermişdir. Keçmiş SSRİ dövründə hər bir tapşırığın Mərkəzdən verildiyi və idarə olunduğu bir vaxtda geridə qalan, çıxılmaz sosial-iqtisadi vəziyyətdə olan Azərbaycanda insanlar dirçəlişin olacağına şübhə ilə yanaşırdılar. Məhz **Ulu öndərin** hakimiyyətə gəlişi xalqda böyük ruh yüksəkliyi yaratdı. **Ulu öndər** qeyd edirdi ki: "Şübhəsiz ki, tariximizin parlaq səhifələri də, qaranlıq səhifələri də var, təntənəli səhifələri də, faciəli səhifələri də var".

Hakimiyyətdə olduğu illərdə respublikada yüzlərlə yeni müəssisə, istehsalat sahələri yaradılmış, iri elektron, elektrotexnika, radiotexnika, cihazqayırma sənayesi zavodları inşa edilmişdir. **Ulu öndər Heydər Əliyev** ölkə rəhbərliyində yüksək vəzifədə çalışarkən öz iti zəkası, yüksək erudisiyası, siyasi uzaqgörənliyi, yorulmaz fəaliyyəti ilə daim diqqət mərkəzində idi və vurğulayırdı ki: **"Böyük siyasəti kiçik hisslərə, xırda mənfəətlərə bağlamaq olmaz"**.



**Xilaskar missiyalı qayıdış- Ulu öndərin** ikinci dəfə siyasi hakimiyyətə gəlişi nəinki Azərbaycanı, bütöv bir xalqı məhv olmaq təhlükəsindən xilas etdi. Xalq ən ağır günlərini yaşadığı bir zamanda sevimli oğlunu, dahi şəxsiyyət **Heydər Əliyevi** ölkəni idarə etməyə çağırdı. Bu təkidli çağırışın arxasında sonsuz xalq etimadı, millətin məhəbbəti və inamı dayanırdı. Lakin onun birinci hakimiyyəti dövründəki abad Azərbaycandan heç nə qalmamışdı. Ümummilli Liderin 1993-cü il iyunun 15-də Azərbaycanda siyasi hakimiyyətə xilaskar missiyalı qayıdışı xalqın milli dövlətçiliyinə və sabahkı gününə inamını özünə qaytardı, ölkə həyatının bütün sahələrinə nüfuz etmiş



böhran aradan qaldırıldı. **Ulu öndər** diqqətə yetirirdi ki: **"Müstəqillik yolu qədər çətin yol yoxdur"**.

Sevindirici haldır ki, **Ulu öndərimizin** ölməz ideyaları bu gün **Prezident** İlham Əliyev tərəfindən uğurla davam etdirilir və ötən müddət ərzində dövlətimizin başçısının yorulmaz fəaliyyəti nəticəsində Azərbaycan dünyanın ən dinamik inkişaf edən ölkələrindən birinə çevrilib. **Ulu öndər** bəyan etmişdi ki: **"Respublikamızda hüquqi dövlət qurulması demokratik, sivilizasiyalı cəmiyyət yaradılması, insan azadlığının, söz, vicdan azadlığının, müasir pluralizmin təmin edilməsi, çoxpartiyalı sistemin bərqərar olması bizim əvvədən qəbul etdiyimiz prinsiplərdir"**. Zaman **Heydər Əliyev** siyasətinin alternativsizliyini və xalqın İlham Əliyevi dəstəkləməklə ən doğru addım atdığını göstərir. Bütün beynəlxalq təşkilatlar birmənalı şəkildə etiraf edirlər ki, Azərbaycanın inkişafı sürətlənib, ümumi daxili məhsul istehsalının artım tempinə görə dünyanın lider dövlətlərindən birinə çevrilib. **Ulu öndər** məntiqi ilə desək: **"Azərbaycanın müstəqilliyi Azərbaycan Respublikasının dünya birliyində tutduğu yer ilə bağlıdır"**.

## YENİLƏŞƏN AZƏRBAYCAN MODELİ

**Ulu öndər** xalqına müraciətlə söyləyirdi ki: "**Əgər qarşımızda duran vəzifələri layiqincə yerinə yetirə bilsək, Azərbaycan xalqı, respublikası müstəqil dövlətimiz üçün gələckdə daha gözəl şərait yarada bilərik**".

**Ulu öndərdən** sonra taleyini etibar etmək istədiyi lider İlham Əliyev idi. **Prezident** İlham Əliyev müxtəlif dövlətlərin siyasilərinin çeşidli mülahizələrilə müşayiət olunan proseslərdə, tez-tez dəyişən olayların çevrəsində dünya şöhrətli atasının bütün fərdi və ideoloji qənaətlərini onunla birgə yaşayırdı. **Ulu öndər** uzaq görən əhmi ilə nəzərə yetirmişdir ki: **"Bəzən tarixdə belə olubdur: böyük istededlar meydana çıxıb, ama qısa bir müddətdə sönüblər. Ona görə yoki, onların istedadları birdən kəsilibdir. Yox, ona görə ki, bəzi səbəblərdən onlar o yolu düz keçə bilməyiblər, o yolla inamla gedə bilməyiblər"**. Ümummilli liderin ən layiqli varisi İlham Əliyev ona görə güclü idi ki, müstəqil Azərbaycan dövlətinə rəhbərlik estafetini qəbul edərək böyük siyasətə gəlişi Ümumilli Lider **Heydər Əliyevin** siyasi, ictimai, əxlaqi məfkurəsi və mədəniyyəti üzərində formalaşmışdı.

**Prezident** İlham Əliyevin həyata keçirdiyi siyasətin nəticəsində Azərbaycanı 30 ilə yaxın davam edən münaqişədə qalib tərəfə çevirdi. Ərazi bütövlüyümüzün birmənalı olaraq təsdiq edildi. "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" - deyən **Ulu öndərin** arzusunu reallaşdırdı: **"Mən bu gün Ulu öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!"**.

Ölkə **Prezidenti** İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər bir azərbaycanlında böyük sevinc və qürur hisləri yaratdı. Bu böyük qələbə eyni zamanda Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı. **"Dağlıq Qarabağ Azərbaycan torpağı, beynəlxalq səviyyədə tanınan ərazimiz olmaqla yanaşı, ədalət məsələsidir, Azərbaycanın milli qürur məsələsidir"**,-deyən **Prezident**imizə olan inamı, sevgini birə beş artırdı.



## 31 DEKABR - BİRLİYİMİZ, HƏMRƏYLİYİMİZDİR

31 dekabr Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü artıq 2020-ci il 8 noyabrdan etibarən qalib ölkənin vətəndaşları olaraq böyük sevinc və qürurla qeyd edirik. Tarix dəfələrlə sübut edib ki, milli birliyi formalaşdırmaq, eyni hədəf uğrunda mübarizəni təmin etmək üçün böyük liderlərə ehtiyac duyulub. **Ulu öndər** dediyi kimi: **"Azadlıq və istiqlaliyyət hər bir xalqın milli sərvətidir"**.

Bu müqəddəs missiyanı həyata keçirən müstəqil Azərbaycanın qurucusu, **Ulu öndər Heydər Əliyev** çoxmilyonlu Azərbaycanlıları birləşdirmək istəyi, arzusu, amalı ilə bu tarixi hadisənin bünövrəsini qoydu. Və 1991-ci ilin 16 dekabrında Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri vəzifəsində çalışan ümummilli lider **Heydər Əliyev** dünya azərbaycanlılarının birliyini yaratmağın əhəmiyyətini nəzərə alaraq 31 dekabr tarixini Dünya Azərbaycanlılarının Həmrəylik Günü kimi elan etməklə həmrəyliyin hüquqi və siyasi təsdiqini reallaşdırdı. **Ulu öndər** qeyd edirdi ki: **"Xalqımızın birliyi və qələbəyə inamı gələcək uğurlarımızın təməlidir"**.

31 dekabr tarixinin bütün dünya azərbaycanlılarının birlik,

həmrəylik günü kimi hər il böyük təntənə ilə qeyd olunduğunu bildirən Azərbaycan **Prezident**i İlham Əliyev dünyanın müxtəlif ölkələrində yaşayan azərbaycanlılarının vahid ideologiya ətrafında sıx birləşməsinin **Ulu öndərin** adı ilə bağlı olduğunu qeyd edərək demişdir: **«Dünya azərbaycanlılarının həmrəyliyi və birliyi üçün Ulu öndər çox böyük səylər göstərmişdir. Hələ 1991-ci ildə Naxçıvanda onun təşəbbüsü ilə 31 dekabr Dünya Azərbaycanlılarının Həmrəylik Günü» kimi elan edilmişdir"**.

Bu tarixi hadisə xaricdə yaşayan on milyonlarla soydaşımızın milli təşəkkülünün, özünüdərk hissinin formalaşması, onların müstəqil Azərbaycan dövləti ətrafında təşkilatlanması, mənəvi, siyasi birliyinin təmin edilməsi işində təkanverici bir amil oldu. **Ulu öndər** vurğulayırdı ki: **"Bütün dünyada soydaşlarımızın bir olması vacibdir"**. Azərbaycanın dövlət müstəqilliyini bərpa etməsi ilə böyük təmtəraqla qeyd olunan milli birlik, bütövlük günümüz qısa müddətdə milli təfəkkür tərzinə çevrilərək dünyanın müxtəlif ölkələrində məskunlaşmış soydaşlarımız üçün milli qürur, mənəvi dayaq və ümid günü oldu. **Ulu öndər** dediyi kimi: **"Azərbaycan xalqı dərin mənəviyyata malik xalqdır"**.

Dünyanın müxtəlif ölkələrində yaşayan soydaşlarımızın müstəqil Azərbaycan Respublikası ilə əlaqələrinin daha da möhkəmləndirilməsi, onların birliyinin və həmrəyliyinin təmin olunması məqsədilə 2001-ci il mayın 23-də **Heydər Əliyevin** imzaladığı sərəncamla 2001-ci il 9-10 noyabr tarixində Bakıda Dünya Azərbaycanlılarının I qurultayı keçirildi. Qurultayda dərin məzmunlu nitq söyləyən **Ulu öndər Heydər Əliyev**;

- dünya azərbaycanlılarının milli birliyinin və həmrəyliyinin təmin edilməsi;
- Azərbaycan dövləti və dünya azərbaycanlılarının əlaqələrinin möhkəmləndirilməsi;
- qarşıya çıxan problemlərin həllində səylərin birləşdirilməsi zərurəti;
- ana dilinin, milli-mənəvi dəyərlərin qorunub saxlanılması, inkişaf etdirilməsi haqqında fikirlərini bildirmişdir.



## "DƏMİR YUMRUQ" SİYASƏTİ

**Ulu öndər məntiqində belə kəlam var: "Həyat mübarizədir. Respublikamızın həyatı daha çox mübarizlik tələb edir".**

Harada yaşamağımızdan, hansı ölkədə fəaliyyət göstərməyimizdən asılı olmayaraq azərbaycanlı olmağın qüruru, sevinci var. Çünki biz azərbaycanlı olaraq qüdrətli, qəhrəman və qədirbilən xalqıq və bizim üçün hər şeydən öncə Vətən anlayışı, azərbaycançılıq məfkurəsidir. Məhz ümummilli məqsəd naminə birləşib dəmir yumruğa çevrilməyi bacarmış Azərbaycan xalqı və onun Qəhrəman Ordusu və **Müzəffər Ali Baş Komandan**ı İlham Əliyevin rəhbərliyi ilə Ermənistan silahlı qüvvələrini darmadağın edərək torpaqlarımızın işğalına son qoydu. Azərbaycanın əzəli tarixi torpağı olan Qarabağın düşmən işğalından azad edilməsi, dövlətimizin ərazi bütövlüyünün bərpa olunması xalqımızı 30 ildən artıq davam edən doğma torpaqlarımızın həsrətinə 44 gün ərzində son qoyan Qalib Liderimiz, **Ali Baş Komandan**, **Prezident** İlham Əliyevin "Dəmir yumruq" əməliyyatı ilə məğlubiyyət

sindromundan qurtardı və onu qalib xalqa çevirdi, tariximizin ən şərəfli səhifəsini yazaraq yenilməz olduq. Və **Ulu öndər** söylədiyi kimi: **"Əsas məqsədlərimiz, amallarımız yolunda hamı birləşməlidir"**.

**Prezident** İlham Əliyevin söylədiyi kimi: **"Müstəqil Azərbaycan bütün azərbaycanlıların vətənidir. Bizim bir vətənimiz var – Azərbaycan! Bizim bir dilimiz var – Azərbaycan dili! Bizim ümumxalq ideologiyamız var – Azərbaycançılıq məfkurəsi! Mən arzu edirəm ki, dünyada yaşayan bütün azərbaycanlılar həmişə bir yerdə olsunlar"**.

Hələ vaxtilə uzaqgörən Dahi **Heydər Əliyev** dühası ilə söylədi ki: **"Biz Azərbaycanın haqq-ədalət işini dünyaya sübut etməli, ölkəmizə qarşı olmuş hərbi təcavüzü dünya ictimaiyyətinə çatdırmalı və beynəlxalq ictimaiyyətin köməyilə Qarabağ məsələsini sülh yolu ilə həll etməliyik"**.

Bu Zəfər qələbəsi bir daha sübut etdi ki, bütün Azərbaycan xalqı **Prezident**i, Silahlı Qüvvələrimizin **Ali Baş Komandanı** cənab İlham Əliyevin ətrafında sıx birləşib, bundan sonra da milli birliyini, həmrəyliyini, sarsılmazlığını nümayiş etdirəcək.

Bu bayram hər bir azərbaycanlıda öz ana Vətəninə məhəbbət, xalqına sədaqət, tarixinə və mədəniyyətinə hörmət kimi nəcib hissləri gücləndirir, bizi birləşdirən mənəvi-əxlaqi dəyərlərin sonrakı nəsillərə ötürülməsinə xidmət edir.

Eyni zamanda, hər il Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü ərəfəsində Azərbaycan Respublikasının **Prezident**i İlham Əliyevin həmvətənlərimizə və bütün soydaşlarımıza ünvanladığı müraciətdə bu yöndə işlərin daha da gücləndiriləcəyinə, yeni vüsət alacağına işarə vurulur, eyni zamanda, əsas diqqət istifadə olunmamış potensialdan maksimum yararlanmağa yönəldilir. XXI əsrin Azərbaycanı həmişəkindən daha güclüdür, çünki harada yaşamağımızdan asılı olmayaraq, milli birlik və həmrəylimiz möhkəmdir, sarsılmazdır.

**Prezident** İlham Əliyev xalqın qalib lideri, Qarabağı işğaldan azad edən ünvanıdır, xilaskardır, Vətənsevər Liderdir!



## 11 APREL – XALQIN PREZİDENTİNƏ GÜVƏNİNİ BİR DAHA MÜƏYYƏNLƏŞDİRDİYİ TARİX

*"Müstəqil Azərbaycan Respublikası yaşayacaq və demokratiya prinsipləri, insan azadlığı, demokratik iqtisadiyyat sahəsində başqa dövlətlər üçün nümunə olacaqdır".*

*Ulu Öndər Heydər Əliyev*

Xalqların yüksəliş salnaməsində, dövlətlərin inkişafında şəxsiyyətlərin, siyasi liderlərin çox böyük rolu olur. Həmin şəxsiyyətlərin öz xalqı, dövləti üçün misilsiz xidmətləri əsrlərin və nəsillərin yaddaşına əbədi həkk olunub. Azərbaycanı tarixin ən qüdrətli dövlətinə çevirən, xalqın 30 illik ən böyük problemi olan Dağlıq Qarabağ münaqişəsini hərb yolu ilə həll edərək adını tarixə qızıl hərflərlə yazdıran İlham Əliyev məhz belə liderlərdəndir.

11 aprel 2018-ci il tariximizin növbəti mühüm dönüş nöqtəsinə, yeni parlaq səhifəsinin ilk sətirlərinin yazıldığı günə çevrildi. 11 apreldə keçirilən **prezident** seçkilərində xalqımız inandığı, sevdiyi şəxsiyyətə - İlham Əliyevə yenidən möhtəşəm güvəncini nümayiş etdirərək ən ali postu ona həvalə etdi. Bu şanlı missiyanın başlanğıc mərhələsi isə 2003-cü

ilin 15 oktyabrı idi. Vətəndaşlarımız İlham Əliyevi öz rəhbəri seçərək milli dövlətçilik tarixinin daha bir doğru qərarını verdi, 15 oktyabr gününü yenilənmə gününə, inkişaf modernlik yoluna qədəmə yönəltdi.

O gündən keçən illər ərzində **Prezident** İlham Əliyev əslində, lider böhranının yaşandığı müasir dünyamızda öz şəxsi nümunəsi ilə yeni dövrün əsl liderinin, kamil dövlət adamının mükəmməl obrazını yaratdı və Azərbaycana rəhbərlik etdiyi illərin hər günü bu dövlətə, bu cəmiyyətə qazandırdığı nailiyyətlərlə mahiyyətcə əsrə bərabərdir. Onun hakimiyyət dövrü Azərbaycanın dinamik inkişaf, sürətli modernləşmə mənzərəsidir. Tarixi təcrübə bunu təkrar-təkrar sübuta yetirib. **Ulu öndər** söylədiyi kimi: **"Müstəqilliyi təmin etmək üçün çox düşünülmüş xarici siyasətə aparmaq lazımdır"**.

**Prezident** İlham Əliyev ölkəmizin milli mənafelərini hər zaman, hər yerdə, bütün səviyyələrdə qətiyyətlə qoruyur, müstəqil xarici siyasət yürüdür. Bütün məsələlərlə bağlı Azərbaycan **Prezident**inin öz fikri, öz sözü, öz mövqeyi var! Bu, eyni zamanda Azərbaycan xalqının fikridir, sözüdür, mövqeyidir! Bütün qərarlarında o, xalqın rəyini ifadə edir, vətəndaşlarımızın dəstəyinə güvənir.**"Mən hər bir**

**Azərbaycan vətəndaşının prezidenti olacağam" - Prezident** kimi ilk andiçmə mərasimində cənab İlham Əliyevin ölkə vətəndaşları qarşısındakı əsas sözü bu olmuşdu. O, ilin hər günündə bu sözünü tutdu. Nəinki hər bir vətəndaşımızın, özünü Azərbaycana bağlı sanan hər kəsin ümid yerinə çevrildi. İnsanlarımızın təhlükəsizliyi, firavan həyatı, inkişafı məramı ilə gördüyü işlərdən, atdığı ardıcıl addımlardan cəmiyyətimizin hər bir üzvü bəhrələnə bildi və bəhrələnməkdədir. 2018-ci il aprelin 11-də keçirilən **prezident** seçkilərində İlham Əliyevin xalqın 86,02 faizinin etimadını qazanaraq növbəti müddətə Azərbaycan **Prezident**i seçilməsi məhz bu sevginin, inamın əyani təzahürü idi. Xalq növbəti dəfə İlham Əliyevi alternativsiz lider kimi qəbul edərək onu özünə rəhbər seçdi və bu günədək baş verən proseslər xalqın seçiminin nə dərəcədə doğru olduğunu göstərdi.

Ölkəmizdə gedən prosesləri izləyən və bu proseslərə vicdanla yanaşan hər bir siyasətçi etiraf edir ki, Azərbaycan cəmiyyətində demokratiyanın təməl prinsipləri mövcuddur və yaradıcılıqla inkişaf etdirilməkdədir: Aşkarlıq, şəffaflıq, söz, mətbuat, etiqad azadlıqları Azərbaycan Konstitusiyası ilə təsbit olunmuş və dövlətimizin fəaliyyətinin prioritet cəhətlərindən biri kimi vətəndaşların həyatında

əksini tapmaqdadır.

Nəhayət, **Prezident**, **Ali Baş Komandan** İlham Əliyev verdiyi vədi gerçəkləşdirdi. Andiçmə mərasimində **Prezident** bəyan etdi ki, Azərbaycan xalqı heç vaxt bu işğal faktı ilə barışmayacaq və torpaqlarımız düşmən tapdağından azad ediləcək. Buna nail olmaq üçün daha da güclü olmalıyıq və olacağıq. Və **Böyük Dahi** söylədiyi kimi **"Ədalətsizliklə ədavəti bərpa etmək olmaz"**.

2020-ci il sentyabrın 27-də əks-hücum əməliyyatları ilə başlayan Vətən müharibəsi düşmənə tarixinin ən ağır zərbəsini vurdu. Düzdür, bu savaş zamanı Azərbaycana böyük təzyiqlər də göstərildi. Ancaq qətiyyətli siyasi iradə nümayiş etdirən **Prezident** İlham Əliyev bütün təzyiqlərə mərdanə şəkildə sinə gərərək, öz prinsipial mövqeyindən dönmədi. Dövlət başçısı əldə olunan Qələbə zamanı xalqa müraciətində də bildirmişdir ki, Azərbaycanda bundan sonra da **Heydər Əliyevin** siyasətini davam etdirəcək:

**"Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm"**,-deyərək son 30 il ərzində həsrətində olduğumuz Qarabağ Azərbaycandır! İmzasına, haqq və şərəf işimiz olan, Azərbaycan Respublikamızın suverenliyi və ərazi bütövlüyümüzə və nəhayət, Qələbə Zəfərimizə nail olduq!

Vaxtilə **Böyük Strateq Heydər Əliyev** demişdi ki: "**Əgər hər hansı ölkənin xalqları öz hüquqlarını anlayır və onları qoruya bilirsə, o zaman ən kiçik dövlət belə ən böyük məmləkət qədər güclü olar"**.

XX əsrin güclü Azərbaycanı artıq regionda lider dövlətdir, dünyada Qalib Ölkə olaraq tanınır.

Məhz hər sözü, hər vədi reallığa çevirən hər bir azərbaycanlı dünyanın harasında olmasından, harada yaşamasından asılı olmayaraq, öz dövləti, öz **Prezidenti** və Onun zəfərləri ilə haqlı olaraq qürur duyur, azərbaycanlı olmağı ilə fəxr edir. Çünki 28 illik "kaş ki..." arzularımız reallaşdı. Xüsusilə də, Novruz tonqallarımız arzusunda olduğumuz Şuşamızda, Cıdır düzündə qalandı. Bu xoşbəxtliyi, bu qüruru qətiyyətli Lider, **Müzəffər** Ordu, yenilməz xalq birliyi verdi və Azərbaycanın yeni və möhtəşəm tarixini yazdı. Müdriklərin fikirlərinə görə, **"rəhbərin ən böyük qələbəsi xalqın etimadı, inamı və sevgisidir"**

## QANUNUN ALİLİYİNİN QARANTI AZƏRBAYCAN PREZİDENTİDİR

**Ulu öndər** vurğulayırdı ki: **"Hamını Azərbaycanın dövlətçiliyinin möhkəmlənməsi, ölkəmizin gələcəyi, müstəqil Azərbaycan dövlətinin qüdrətlənməsi naminə fəaliyyətə, birliyə, əməkdaşlığa dəvət edirəm"**.

Hər bir ölkənin inkişafında idarəçilik sistemində təkmilləşmə əhəmiyyətli rol oynayır. Bu fikir beynəlxalq səviyyədə də qeyd edilir ki, yoxsul deyil, yaxşı idarə olunmayan ölkələr var. Azərbaycanın bu sahədə təcrübəsi nümunə göstərilir. Daim yeniliyə, təkmilləşməyə meyilli olan və bunu atdığı addımları ilə təsdiqləyən ölkəmizin zamanın tələbi ilə idarəetmədə apardığı islahatlar davamlılığı ilə diqqət çəkir. Reallıq budur ki, ölkə iqtisadiyyatının inkişafında, sosial islahatların həyata keçirilməsində kadr islahatlarının rolu böyükdür. Bu baxımdan respublikada dövlət idarəçiliyi sistemi xalqın və dövlətin maraqları, milli mənafelər nəzərə alınmaqla təkmilləşdirilir, hədəflərə, müasir dövrün çağırışlarına uyğun addımlar atılır.

Ölkənin dövlət idarəetmə sistemində həyata keçirilən struktur islahatları çərçivəsində gənc kadrlara xüsusi etimad göstərilməsi təqdirəlayiq hal, gələcəyimizə təminatdır. Ölkəmizdə gənclər siyasətinin əsas prinsiplərindən olan yeni nəslin nümayəndələrinin dövlət idarəçiliyində irəli çəkilməsi ənənəsi hazırda daha intensiv, bütün sahələr üzrə davam etdirilir. Ümummilli lider **Heydər Əliyev** tərəfindən əsası qoyulan, **Prezident** İlham Əliyevin uğurla davam etdirdiyi siyasətin nəticəsidir ki, ölkəmizdə bütün sahələrdə gənclərdən ibarət peşəkar kadr potensialı formalaşıb. Zamanında **Böyük Siyasi Lider Heydər Əliyev** vurğulayırdı ki: **"Biz Azərbaycan dövlətçiliyini qorumağa qadirik və bundan sonra da qoruyacağıq"**.

Təcrübə göstərir ki, yeni nəslə etimadın artması ölkə gəncliyinin stimullaşdırılması baxımından da vacibdir. Gənclərin rəhbər vəzifələrə, idarəetmə strukturlarında irəli çəkilməsi köhnə stereotiplərdən uzaqlaşmaq, zamanın tələblərinə yeni yanaşma baxımından da əhəmiyyətlidir. Bu cür inkişaf isə əlbəttə ki, ümumilikdə ölkənin, cəmiyyətin xeyrinədir. Bu, bir reallıqdır ki, texnologiyalar əsri adlandırılan, elmin tərəqqi etdiyi müasir dövrümüzdə gənclər insanları möcüzələri



ilə heyrətləndirən yeni texnologiyaları daha çox və tez mənimsəyirlər. Bu baxımdan yaşlı nəslin təcrübəsi ilə gəncliyin enerjisinin birlikdə tətbiqi idarəçilik sistemində daha çox səmərə verir. Buna görə də son illərdə aparılan kadr islahatlarının tərkib hissəsi olan gənclərin idarəetmə strukturunda, hökumət işlərində irəli çəkilməsi ənənəsi özünü doğruldur və davam etdirilir.

## İLHAM ƏLİYEV – İSLAHATÇI PREZİDENT

Ölkəmizdə baş verən uğurlu nailiyyətlər onu deməyə əsas verir ki, **Prezident** İlham Əliyevin iqtisadi və siyasi islahatları 2003-cü ildə "**Prezident** seçiləndə" başlayıb. **Prezident** hər dəfə əbəs yerə demir ki, xalqın birinci xidmətçisi mənəm və bütün dövlət məmurları belə işləməlidirlər. Bu artıq idarəetmənin fəlsəfəsi deməkdir, bu artıq lider-xalq münasibətinə yeni baxışdır.

**Ulu öndər** qətiyyətlə tələb edirdi ki: **"Ən mühüm vəzifə konstitusiyanı daha dərindən mənimsəmək və onun verdiyi təminatlarından bəhrələnməkdən ibarətdir"**.

Göründüyü kimi, elə bu tezislə **Prezident** İlham Əliyev ilk öncə iqtisadi islahatlara start verdi, qeyri-neft sektorunda ciddi irəliləyiş yarandı, ənənəvi aqrar sahələri, pambıqçılığı, üzümçülüyü, çayçılığı inkişaf etdirdi. Məqsəd iqtisadi bazanı yaratmaq idi, çünki iqtisadi baza olmadan digər sferalarda islahatlar nəticə vermir. **Prezident**in aydın zəkası, zəngin bilik və təcrübəsi, çoxsahəli fəaliyyəti və zəhməti hesabına Azərbaycanda müasir tələblərə cavab verən dövlət idarəçilik sistemi yaradılmışdır. Yeniləşən dünyanın tələblərinə cavab verən gənc kadrların vəzifələrə gətirilməsi ölkəmizin bu günü və gələcəyi üçün mühüm əhəmiyyət daşıdığı hər kəsə məlumdur. Məhz buna görə də bütün sahələrdə yeni düşüncəli, savadlı, işgüzar, bacarıqlı, saf mənəviyyatlı, yüksək təşkilatçılıq qabiliyyətinə malik olan gənc kadrlar mühüm dövlət vəzifələrinə irəli çəkilir. Hər bir dövlət məmuru öz vəzifəsini şərəflə vicdanla ləyaqətlə yerinə yetirməyə borcludur. Kadrların seçilməsində onların iş qabiliyyəti, dövlətçiliyə, dövlətə sədaqətləri, vətənpərvərliyi əsas götürülür. 2022-ci il iyul ayının 25-də ölkə başçısı Masallı, Lerik və Göygöl Rayon İcra Hakimiyyətlərinin yeni başçılarını vəzifələrinə təyin olunmaları ilə əlaqədar qəbulu zamanı çıxışında çox vacib və mühüm məqamlara toxundu. Qeyd etdi ki, **siz daim insanlarla təmasda olmalı, insanların qayğıları ilə yaşamalı, onları narahat edən problemləri dinləməli və imkan daxilində bu problemləri həll etməlisiniz. Əgər bir kəndin problemi həll olunursa, demək olar ki, ölkədə insanları narahat edən ciddi problem qalmayacaq. «Əfsuslar olsun ki, belə hallar çoxdur. Bu gün bir daha demək istəyirəm ki, bu hallara qarşı çox ciddi mübarizə aparılır. Çünki idarəetmədə çox ciddi islahatlar aparılır, çox böyük təmizləmə işləri aparılır»**, deyən **Dövlət Başçısı** bir daha məmurlara xəbərdarlıq etdi: **«Bu işlərə rəvac verən və bəzi dövlət məmurlarını, yerli icra orqanlarını bu qanunsuz işlərə təhrik edən**

**insanlar hakimiyyətdən uzaqlaşdırıldı. Hakimiyyət təmizlənir və insanlar da bunu görürlər. Ona görə siz dövlət məmurları kimi bu hallara çox ciddi fikir verməlisiniz. Bunu mən sizə deyirəm və bütün dövlət orqanlarının nümayəndələrinə deyirəm, eyni zamanda, qanunsuz işlərlə məşğul olmaq istəyən insanlara deyirəm: Əl çəkin bundan! Cəzalandırılacaqsınız və cəzalandırılırlar».**

**Prezident** İlham Əliyev bir daha bildirdi ki: «**Heç kim qanundan üstün ola bilməz. Mən bütün icra başçılarını vəzifəyə təyin edərkən göstərişlərimdən biri o idi ki, korrupsiyaya, rüşvətxorluğa qarşı biz amansız mübarizə aparmalıyıq və icra başçıları burada nümunə olmalıdırlar. Əfsuslar olsun ki, bəziləri əyri yolla gediblər və bu gün bunun acısını çəkirlər. Bu, hər bir dövlət məmuru üçün dərs olmalıdır».**

Ölkə başçısı, **Prezident** İlham Əliyevin yeni təyin olunmuş icra başçılarını qəbul etməsi, onlara müvafiq tapşırıqlarını və tövsiyyələrini verməsi, Azərbaycan **prezident**inin apardığı siyasətin mərkəzində vətəndaş məmnunluğunun dayanmasının bariz sübutudur. **Ulu öndərin** göstərdiyi kimi: **"Böyük siyasəti kiçik hisslərə, xırda mənfəətlərə bağlamaq olmaz"**. Eyni zamanda bu amil bir daha göstərir ki, heç bir kəs qanundan üstün deyil və hər bir dövlət məmurunun fəaliyyəti xüsusi nəzarətdədir. **Prezident** İlham Əliyev hər zaman bütün dövlət məmurlarına xalqın arasında olmağı, onların problemlərinin öyrənilməsi və həmin problemlərin aradan qaldırılması istiqamətində lazımi işlərin görülməsi, vətəndaş məmnunluğunun təmin edilməsi kimi məsələləri ali vəzifə olaraq qarşıya qoymuşdur.

Eyni zamanda Azərbaycan **Prezident**i İlham Əliyev öz fəaliyyəti ilə də bütün dövlət məmurlarına əsl nümunədir.

Ən əsası isə, ölkə başçısı cənab İlham Əliyevin əsas tələblərindən və Azərbaycan dövlətinin sosial siyasətinin prioritet hədəflərindən biri də şəhid ailələrinə, qazilərə və müharibə veteranlarına xüsusi qayğının göstərilməsidir. Bu gün şəhid ailələri, qazilər və müharibə veteranları ölkə başçısı İlham Əliyevin rəhbərliyi altında Azərbaycan dövlətinin diqqət mərkəzindədir və dövlətimizin hərtərəfli qayğısı ilə əhatə olunublar. Hər bir dövlət məmuru ölkə başçısı İlham Əliyevin səsləndirdiyi iradlar hamı üçün dərs olmaqla, həm də dövlət başçısının tövsiyyələrinə əməl etməli, qarşıya qoyduğu ali vəzifələri məsuliyyətlə icra etməli, ona olan etimadı və etibarı doğrultmalıdır.

**Böyük Lider Heydər Əliyev** qeyd etdiyi kimi ki: **"Dünya ümumiyyətlə quruculuqla, tikib-yaratmaqla yaşayıb, inkişaf edibdir"**.



## UĞURLARIN ZİRVƏSİ TARİXİ ZƏFƏRİMİZDİR

**Böyük Lider Heydər Əliyev** söyləmişdir: **"Xalqın tarixində sərkərdələrin də, siyasətçilərin də böyük rolu var"**.

15 oktyabr 2003-cü il. Bu təqvim həm Cənubi Qafqazın ən böyük siyasi qüvvəsi olan Yeni Azərbaycan Partiyasının, həm də müasir Azərbaycanın dövlətçilik tarixinin şanlı səhifələrindən biri kimi yaddaşlara yazılan, xalqın öz liderinə səs verdiyi tarixi gündür. Bəli, müasir Azərbaycan dövlətinin siyasi yüksəlişinin növbəti mərhələyə keçid etməsindən, İlham Əliyevin ilk dəfə **prezident** seçilməsindən 20 il ötür. 2003-cü ilin 15 oktyabr tarixində demokratik qaydada keçirilən seçkilərdə səsvermə hüququna malik olan vətəndaşların 71.5%-i (3,046,401 vətəndaş) iştirak edərək, Yeni Azərbaycan Partiyasının namizədi, partiya Sədrinin birinci müavini, Azərbaycan Respublikasının Baş naziri İlham Əliyev olmuşdur. Azad, ədalətli və şəffaf şəkildə keçirilən seçkilərdə İlham Əliyev ümumi seçicilərin 2 milyon 438 min 787 nəfərin səsini qazanaraq, yəni 76.84% faizdən çox səs toplayaraq Azərbaycan Respublikasının **Prezident**i seçilmişdir. Bu, ilk növbədə, xalqın müasir Azərbaycan dövlətinin qurucusu, ümummilli lider **Heydər Əliyev**ə olan inamının göstəricisi idi. Çünki dahi şəxsiyyət seçkilərdən öncə xalqa müraciət edərək «O, yüksək intellektli, praqmatik düşüncəli, müasir dünya siyasətini və iqtisadiyyatını gözəl bilən, enerjili və təşəbbüskar bir şəxsiyyətdir.

İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm" dedikdə, özünün alternativsiz siyasi kursunu davam etdirə biləcək ünvanı göstərmişdi.

**Ulu öndər** tam əmin idi ki, müstəqil Azərbaycanın işıqlı gələcəyi üçün məyyənləşdirdiyi inkişaf konsepsiyasını məhz cənab İlham Əliyev uğurla davam etdirərək reallığa çevirə bilər. Və **Ulu öndər** məntiqi ilə desək: **"Xalqımız bəşər tarixinəı böyük, dəyərli, dahi simalar bəxş etmişdir"**.

**"Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm"** -Dahi lider **Heydər Əliyev** bilirdi ki, liderlik bacarığı elə siyasətçilərə məxsusdur ki, onlar xalqının, dövlətinin milli maraqlarını qorumaqla yanaşı, həm də öz ölkəsini davamlı şəkildə inkişaf etdirir, yorulmadan irəliyə doğru apara bilir. Bu mənada ölkəmizə uzun müddət dünya siyasətinin fenomeni, bütün həyatını canından artıq sevdiyi doğma xalqına həsr etmiş **Heydər Əliyev** kimi dahi şəxsiyyət xalqa müraciətində Ona özü qədər inandığını və Azərbaycanın gələcəyinə böyük ümidlər bəslədiyinin nəticələrini bu gün bütün dünya görür. Və ümummilli lider **Heydər Əliyevin** ideyaları, müəyyənləşdirdiyi prioritetlər, dövlətçiliyimizin hərtərfli inkişaf konsepsiyası onun layiqli davamçısı, **Prezident** İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Bütün bunların sayəsində illərdir ki, ölkəmiz intibah və çiçəklənmə dövrünü yaşayır. Sanki dünəndən bu günü görən **Ulu öndər** söylədiyi kimi: **"Xalqımızın həyat tərzində, dünya görüşündə böyük dəyişikliklər əmələ gəlmiş, böyük bir siyasi-ictimai proses başlamışdır. Bunlar hamısı keçdiyimiz dövrün, onun mərhələlərinin bəhrəsi nəticəsidir"**.

İlham Əliyev 2003-cü ildə **Prezident** seçilərkən Azərbaycan həlli müşkül görünən bir sıra problemlərlə üz-üzə idi. O vaxt ölkə hələ yeni-yeni dirçəlirdi, işsizlik, məcburi köçkünlərin acınacaqlı halı, bölgələrin inkişafdan geri qalması, əhalinin sosial vəziyyəti ciddi narahatlıq doğururdu. **Prezident**in ilk vədi bu oldu: ölkədə yüz minlərlə yeni iş yeri yaradılacaq. Ötən illər ərzində 2 milyondan çox iş yeri yaradıldı. İşsizlik səviyyəsi 40 faizdən 5 faizə endi. Ölkə **Prezident**i deyirdi: «Azərbaycanda bir dənə də olsun çadır düşərgəsi qalmayacaq». Çox keçmədən axırıncı çadır düşərgəsi ləğv olundu.



Ən əsas məsələ isə bütün dünyanı bürüyən COVID-19 pandemiyasıdır ki, bu gün Azərbaycan pandemiyaya qarşı mübarizədə göstərdiyi nümunə diqqətəlayiqdir. Belə ki, Azərbaycanda koronavirus pandemiyasından bir qədər əvvəl həyatın bütün sahələrinə təsir göstərən böyük islahatlar elan edildi və qısa müddətdə həyata keçirildi. Azərbaycanda bütün sahələrdə sabitlik təmin edildi, əhalinin məşğulluq problemləri müsbət həllini tapdı və sadə vətəndaşın rifah halı iqtisadi inkişafının əsas prioritetlərindən birinə çevrildi. Ölkədə qeyri-neft sektorunun inkişafı neft strategiyasının məntiqi davamı oldu. Güclü iqtisadiyyatın hər bir ölkənin inkişafında mühüm amil olduğunu bəyan edən **Prezident** İlham Əliyev ölkə iqtisadiyyatında qeyri-neft sektorunun çəkisinin artırılması ilə bağlı tədbirlər gördü. Yüzlərlə səhiyyə ocağının, müalicə-diaqnostika mərkəzlərinin inşası səhiyyə sisteminin inkişafını göstərdi. Ölkədə minlərlə məktəb tikildi, təhsil müəssisələrinin maddi-texniki bazası gücləndirildi. Azərbaycanda nəqliyyat sisteminin yenidən qurulması ölkəmizin dünyaya çıxışını təmin etdi. **Prezident**i İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində bir daha bildirmişdi ki, Azərbaycanın xoşbəxt gələcəyinə inanıram: **"Ancaq bütün bunları həyata keçirmək**



**və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm."**

**Prezident** İlham Əliyev bu məsuliyyəti uğurlu addımları ilə gerçəkləşdirdi, Azərbaycana biri-birindən əhəmiyyətli uğurlar qazandırdı. Son 20 ildə **Prezident** İlham Əliyevin təkmil və uzaqgörən inkişaf strategiyası nəticəsində ölkəmiz dayanıqlı və davamlı iqtisadi inkişafa nail oldu. Ən əsası isə «**Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm**»,-deyən Azərbaycan **Prezidenti** İlham Əliyevin qalib lider olaraq bütün öhdəliklərini reallaşdırmaqdadır.

**Ulu öndər** söylədiyi kimi: "**...Yaradılan hər şeylə fəxr edir və buinları yaradanları daim xatırlayır, onların öz minnətdarlığımızı bildiririk**".

## AZƏRBAYCANLILARIN SOYQIRIMI - TARİXİN QANLI SALNAMƏSİ

**ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV VURĞULAMIŞDIR:** ***«Xalqımıza qarşı törədilmiş soyqırımı haqqında həqiqətləri real faktlar, dəlillər əsasında dünya dövlətlərinə, nüfuzlu beynəlxalq təşkilatlara çatdırmaq, saxta erməni təbliğatı nəticəsində formalaşmış yalan təsəvvürləri dəyişdirmək, ona hüquqi-siyasi qiymət verdirmək nə qədər çətin olsa da, şərəfli və müqəddəs bir iş kimi bu gün də, gələcəkdə də davam etdirilməlidir».***

**PREZİDENT İLHAM ƏLİYEV:** ***«Ermənistan dövlətinin və erməni lobbisinin təcavüzkar siyasəti iflasa məhkumdur. Son illərin təcrübəsi göstərir ki, erməni işğalçılarının və onların havadarlarının imkanları heç də qeyriməhdud deyil və bu imkanlar getdikcə daralmaqdadır. Bu siyasətə qarşı geniş iqtisadi potensiala malik qüdrətli Azərbaycan dövləti, onun siyasi nüfuzu, dünya azərbaycanlılarının və Azərbaycanın dostlarının getdikcə möhkəmlənən həmrəyliyi, nəhayət, güclü Azərbaycan ordusu dayanır. Biz dünya siyasətinə ciddi təsiri olan böyük dövlətlərlə müntəzəm və məhsuldar iş aparır, onilliklər boyu formalaşmış stereotipləri, yanlış yanaşmaları dağıtmağa çalışır və çox hallarda buna müvəffəq oluruq».***

Son iki yüz ildə Azərbaycan tarixinə bir çox şanlı səhifələrlə yanaşı, faciələr və soyqırımları, müsibətlərlə dolu səhifələr də yazılıb. Bu dəhşətli hadisələrdən biri 1918-ci ilin mart-aprel aylarında yaşanmışdı. Sovet hakimiyyəti dövründə təxminən 70 il xalqın qan yaddaşını silməyə aramsız cəhdlər göstərilsə də, bu, mümkün olmadı və nəhayət, həqiqət anı yetişdi.

Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra xalqımızın tarixi keçmişinin obyektiv mənzərəsini ortaya qoymaq imkanı yarandı. İndi uzun illər gizli saxlanılan, üzərinə qadağa qoyulmuş həqiqətlər bir-bir açılır.

**Ulu öndər Heydər Əliyevin** "Azərbaycanlıların soyqırımı haqqında" 1998-ci il 26 mart tarixli Fərmanı ilə soyqırımı aktlarına siyasi-hüquqi qiymət verilməsi bu sahədə aparılan tədqiqatlara, həqiqətin üzə çıxarılması istiqamətində səylərin artırılmasına təkan verdi. **Ulu öndər** demişdir **"Tariximiz bizim üçün dərs olmalıdır"**.

Azərbaycan xalqına qarşı törədilmiş bütün soyqırımı faciələrini qeyd etmək məqsədilə 31 mart Azərbaycanlıların Soyqırımı Günü elan edildi. 1918-ci ilin mart soyqırımları öz amansızlığına və miqyasına görə təkcə Azərbaycan tarixində deyil, bəşər tarixində də ən qanlı faciələrdən biridir. Əllərinə düşən fürsətdən istifadə edən ermənilər uşaq, qoca, qadın demədən minlərlə insanı qılıncdan, süngüdən keçirdilər, diri-diri yandırdılar. Milli memarlıq incilərini, məktəbləri, xəstəxanaları, məscid və digər abidələri dağıtdılar. Bakının böyük bir hissəsini xarabalığa çevirdilər. Azərbaycanlıların soyqırımı təkcə Bakıda deyil, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda, Lənkəranda, Gəncədə və digər bölgələrdə xüsusi qəddarlıqla həyata keçirildi. Bu ərazilərdə dinc əhali kütləvi surətdə qətlə yetirildi, şəhər və kəndlər yandırıldı, milli mədəniyyət abidələri dağıdılıb məhv edildi. Təxminən iki yüz il ərzində ermənilərin öz havadarlarının köməyi ilə «böyük Ermənistan» yaratmaq kimi qondarma ideyanın gerçəkləşdirilməsi yolunda atdıqları addımlar Azərbaycan xalqına qarşı kütləvi qətllərin və soyqırımı aktlarının reallaşması ilə nəticələnib. XX əsrin əvvəllərində ermənilər təkcə bu gün Ermənistan adlanan ərazidə deyil, Cənubi Azərbaycanda, Borçalıda, Bakı quberniyasında, Şamaxı, Quba, Göyçay qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda da zaman-zaman azərbaycanlılara qarşı kütləvi qırğınlar, talanlar, terror və digər zorakılıq aktları həyata keçiriblər. Təkcə 1917-ci ilin dekabrından 1918-ci ilin mart ayına qədər Andranikin rəhbərliyi altında erməni qoşun hissələrinin fəal iştirakı ilə İrəvan qəzasında 32 kənd, Eçmiədzin qəzasında 84, Nor-Bəyazid qəzasında 7, ümumiyyətlə, 197 kənd dağıdılıb, sakinləri ən vəhşi üsullarla qətlə yetirilib.

**Ulu öndər** də qeyd edirdi ki: **"Biz yaşadığımız uzun bir dövrü silib-poza bilmərik"**.

1918-ci ilin mart ayında yaranmış mürəkkəb şəraitdə Azərbaycanın müxtəlif yerlərində erməni-daşnak və bolşevik dəstələri azərbaycanlı əhaliyə qarşı kütləvi qırğınlar törədiblər. Anadoluda soyqırımları törətdiklərinə görə cəzasız qalmayacaqlarından təşvişə düşən erməni-daşnak dəstələri rus Qafqaz cəbhəsi dağıldıqdan sonra ordu hissələri ilə birlikdə Cənubi Qafqaza gəldilər. Həmin vaxt regionda anarxiya hökm sürürdü. Qafqaz cəbhəsindən qayıdaraq Bakıdan keçib Rusiyaya getməli olan rus əsgərləri yolboyu Azərbaycan kəndlərini talan edir, aclıq və səfalət içərisində olduqlarından Bakı Sovetinin xidmətində



qalmağı vətənə dönməkdən üstün tuturdular. Ordu silah və sursatını ermənilərə və Bakı bolşeviklərinə vermişdi.

1918-ci ilin martında daşnak Stepan Şaumyan Qafqazın fövqəladə komissarı təyin edildi və Bakıya göndərildi. Həmin vaxtdan "Əks-inqilabi ünsürlərlə mübarizə" şüarı altında maskalanan daşnak-bolşevik S.Şaumyanın rəhbərliyi ilə Bakı Kommunası Bakı şəhərini azərbaycanlılardan təmizləmək kimi mənfur bir planı həyata keçirdi.

1918-ci ilin 30 mart 3 aprel tarixləri arasında Bakı şəhərində, Bakı quberniyasının müxtəlif bölgələrində, eləcə də Naxçıvan, Quba, Xaçmaz, Lənkəran, Hacıqabul, Salyan, Şamaxı, Qarabağ və digər ərazilərdə Bakı Soveti və Daşnaksütyun partiyasının silahlı dəstələrinin azərbaycanlılara qarşı törətdikləri qırğın nəticəsində minlərlə insan məhv edilib, milli-memarlıq abidələri, məktəblər, xəstəxanalar, məscidlər və digər tikililər dağıdılıb.

Burada yenə **Ulu öndər** deyimi yada düşür ki: **"Azərbaycan xalqı aciz deyil, onun qəhrəmanlıqla dolu keçmişi var"**.

Ermənilərin azərbaycanlılara qarşı törətdikləri bu soyqırımı nəticəsində 1918-ci ilin mart-aprelində Bakı, Şamaxı, Quba, Muğan və Lənkəranda 30 mindən çox soydaşımız qətlə yetirilib, 10 minlərlə insan öz torpaqlarından qovulub. Təkcə Bakıda 12 min azərbaycanlı xüsusi qəddarlıqla öldürülüb, Şamaxıda 58 kənd dağıdılıb, 7 min nəfər (1653 qadın, 965 uşaq) məhv edilib. Quba ərazisində 122, Qarabağın dağlıq hissəsində 150, Zəngəzurda 115, İrəvan quberniyasında 211, Qars əyalətində 92 kənd yerlə -yeksan olunub.

1918-ci il martın 31 də Bakı şəhərində azərbaycanlıların kütləvi qırğınında Bakı Sovetinin 6 min silahlı əsgəri, eyni zamanda, Daşnaksütyun partiyasının 4 minlik silahlı dəstəsi iştirak edirdi. Üç gün davam edən qırğın zamanı erməni silahlıları bolşeviklərin köməyi ilə azərbaycanlıların yaşadıqları məhəllələrə qəflətən basqınlar edib, uşaqdan böyüyədək hər kəsi qətlə yetiriblər. Həmin dəhşətli günlərin şahidi olmuş Kulner soyadlı bir alman, 1925-ci ildə Bakı hadisələri barədə yazırdı: "Ermənilər müsəlman (azərbaycanlı) məhəllələrinə soxularaq hər kəsi öldürür, qılıncla parçalayır, süngü ilə dəlmə-deşik edirlər. Qırğından bir neçə gün sonra bir çuxurdan çıxarılan 87 azərbaycanlının cəsədinin qulaqları və burunları kəsilmiş, qarınları yırtılmış, cinsiyyət orqanları doğranmışdır. Ermənilər uşaqlara acımadıqları kimi, yaşlılara da rəhm etməmişdilər". **Ulu öndər** əbəs yerə deməmişdir ki: **"Tarimizdəki qara ləkələri, qara səhifələri unutmaq da olmaz"**.

31 mart soyqırımı ermənilərin öz havadarlarının köməyi ilə iki yüz il ərzində xalqımıza qarşı törədilmiş genosid siyasətinin davamı idi. Bu qanlı faciəyə əsl hüquqi qiymət **Ulu öndər** tərəfindən verildi. Məhz ümummilli lider **Heydər Əliyev** 1998-ci il martın 26-da "1918-ci il mart soyqırımı haqqında" Fərman imzalayıb. Fərmanda bu hadisələrlə bağlı Milli Məclisin sessiyalarının keçirilməsi, bu sahədə tədqiqat işlərinin aparılması, hər il mart ayının 31-nin milli matəm günü kimi qeyd edilməsi, bu faciənin dünya ictimaiyyətinə çatdırılması kimi konkret vəzifələr qoyulub. Bildirilib ki, bununla da Azərbaycan tarixində erməni məsələsinə münasibətdə yeni strategiya müəyyənləşib. Həmin ildən etibarən bütün xalqımız bu tarixi "31 Mart Azərbaycanlıların soyqırımı günü" kimi qeyd edir.



## AZƏRBAYCANIN MÜSTƏQİLLİK GÜNÜ!

**Prezident İlham Əliyev: «Əminəm ki, bizim müstəqillik inkişafımız davamlı olacaq və Azərbaycanın dövlət müstəqilliyi əbədi yaşayacaq»**

Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan Azərbaycan dövləti - **Qalib Sərkərdə Prezident** İlham Əliyevin "Dəmir yumruq" siyasətinin gücü ilə Güclü Ordumuzun rəşadətli əsgər və zabitlərinin birliyi və qəhrəmanlığı ilə xalqımızın müstəqillik arzularını gerçəkləşdirdi. **Ali Baş Komandanımız, Prezident İlham Əliyev** 28 May – Müstəqillik Günü ilə bağlı paylaşımında dediyi kimi: **"Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan bugünkü Azərbaycan dövləti xalqımızın müstəqillik arzularını gerçəkləşdirdi. Əminəm ki, bizim müstəqillik inkişafımız davamlı olacaq və Azərbaycanın dövlət müstəqilliyi əbədi yaşayacaq".**




**Ulu öndər** vurğuladığı kimi: **"Xalq gərək daim öz kökünü xatırlasın, tarixini öyrənsin"**.

28 May Azərbaycanın Müstəqillik Gününü daha fərqli- Qalib ölkənin, qalib vətəndahları kimi qeyd edirik. Azərbaycan Xalq Cümhuriyyəti Şərqdə ilk demokratik dövlət quruluşu olub və xalqımızın müstəqillik əzmini nümayiş etdirib. Cümhuriyyətin yaradılmasında və fəaliyyət göstərməsində Əlimərdan bəy Topçubaşovun, Fətəli xan Xoyskinin, Məhəmmədəmin Rəsulzadənin, Həsən bəy Ağayevin, Nəsib bəy Yusifbəylinin, Səməd bəy Mehmandarovun, Əliağa Şıxlinskinin və başqalarının böyük xidmətləri olub. Əldə olunmuş müstəqilliyin 23 ay davam etməsinə baxmayaraq, bu müddətdə Azərbaycanda demokratik hüquq və azadlıqlar bərqərar olub, Azərbaycan dili dövlət dili elan edilib, təhsil və mədəniyyətin inkişafına xüsusi diqqət göstərilib, milli ordu və təhlükəsizlik strukturları qurulubdur.

Azərbaycan Xalq Cümhuriyyətinin yaşadığı qısa müddət ərzində zəngin dövlət quruculuğu təcrübəsi ilə milli dövlətçilik tarixində

silinməz izlər qoyub, dövlət institutlarının təsis olunması, qadınlara səsvermə hüququnun bəxş edilməsi, tolerantlıq ənənələrinin əsasının qoyulması kimi tarixi nailiyyətlərə imza atıb.

**Ulu öndər** söyləmişdir ki: **"Müsəlman Şərqində ilk demokratik Cümhuriyyət məhs Azərbaycan torpağında yaranmışdır"**.

Azərbaycan Xalq Cümhuriyyəti təcavüzə məruz qaldığı üçün qarşıya qoyduğu məqsədlərə tam müvəffəq ola bilmədən süquta uğrasa da, onun şüurlarda bərqərar etdiyi müstəqillik ideyası unudulmadı. Azərbaycan xalqı ötən dövr ərzində milli dövlətçilik atributlarının bir çoxunu qoruyub saxlaya bildi.

Ümummilli lider **Heydər Əliyevin** respublikada uğurla gerçəkləşdirdiyi siyasət xalqımızın tarixi-mədəni yaddaşını özünə qaytararaq milli mənlik şüurunu inkişaf etdirdi, azərbaycançılıq məfkurəsi işığında müstəqillik arzularının güclənməsi və yaxın gələcəkdə yenidən həqiqətə çevrilməsinə zəmin yaratdı. Onun şüurlara aşılamış olduğu müstəqillik ideyaları bütün məhrumiyyətlərə baxmayaraq, xalqımızın yaddaşından heç vaxt silinmədi. 70 illik sovet hakimiyyəti dövründə xalqımız milli azadlıq ideallarını qorudu, yaşatdı və nə vaxtsa onların həyata vəsiqə alacağına inamını heç vaxt itirmədi.

**Ulu öndər** göstərdiyi kimi: **"Tarixi təhrif etmək xəstəliyi aradan götürülməldir"**.

**Ulu öndər Heydər Əliyev** demişdir: **«Ən əsası odur ki, Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızda azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu»**. Tarix hər zaman ədalətin gec də olsa, bərpa olunması ilə təkrarlanıb. XX əsrin əvvəlində xalqımız qarşısında tarixi əhəmiyyət kəsb edəcək işlər görməyi qarşısına məqsəd qoyan Azərbaycan Xalq Cümhuriyyətinin süqutundan 73 il sonra xalqımız bir daha müstəqillik əldə etdi.

Məlum olduğu kimi, 1991-ci il oktyabrın 18-də qəbul olunan Konstitusiya Aktında Azərbaycan Respublikasının AXC-nin siyasi varisi olması elan olundu. Bəzən «tarix təkrar olunur» deyirlər və 1993-ci ildə də tarixin təkrar olunmaması, müstəqilliyin itirilməməsi üçün xalqımız **Ulu öndər Heydər Əliyev**i Azərbaycanda siyasi hakimiyyətə yenidən qayıdışı və Onun müəyyənləşdirdiyi strateji kurs sayəsində siyasi, hüquqi, iqtisadi, sosial, mədəni, ideoloji və digər sahələrdə əldə edilən nailiyyətlər Azərbaycanı müasir,

müstəqil və güclü milli dövlətə çevirdi.

Müasir, müstəqil dövlət kimi çıxış edən ölkəmiz özünün tərəqqisi ilə milli inkişafın Azərbaycan modelinin əsasını qoydu. Ümummilli Lider **Heydər Əliyev** hər zaman Azərbaycan Xalq Cümhuriyyətinin ölkəmizin müstəqillik tarixində mühüm yerə malik olduğunu bildirirdi.

Əsası ümumilli lider tərəfindən qoyulmuş və hazırda **Prezident** İlham Əliyev tərəfindən uğurlu həyata keçirilən xarici siyasət strategiyası dövlətlərarası əlaqələrə daha yaxından qatılaraq regionda, eləcə də dünyada baş verən əsas iqtisadi, siyasi və mədəni proseslərdə Azərbaycan dövləti layiqincə təmsil olunur, öz mövqeyini bildirərək mənafelərini qoruyur. Ölkə daixilində gedən demokratik proseslər və iqtisadi yüksəlişlə yanaşı, uğurlu xarici siyasət bu gün dünyanın aparıcı dövlətlərinin, nüfuzlu beynəlxalq təşkilatların diqqətini Azərbaycana yönəltmiş və bu da beynəlxalq hüquq normalarına uyğun qarşılıqlı faydalı əməkdaşlığın yaranmasına və inkişafına əlverişli zəmin yaratmışdır.

Ümummilli lider **Heydər Əliyevin** xarici siyasət kursunu novatarcasına, dinamik şəkildə və çox uğurla davam etdirən **Prezident** İlham Əliyev çıxışlarında AXC-nin Azərbaycan xalqı üçün tarixi hadisə olduğunu bildirmişdir: «Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması tarixi hadisə idi. Xalqımız üçün tarixi hadisə idi. Ona görə ki, Azərbaycan xalqı əsrlər boyu arzuladığı müstəqilliyə qovuşurdu».

İşğal və Qələbə. Bir faktı vurğulamaq lazımdır ki, tarix qalibləri mühakimə etmir, həm də bu qalib haqq işi uğrunda qələbə qazanırsa! Bəli, bu gün **Ali Baş Komandan**ımız, **Prezident** İlham Əliyev bu tarixi qələbəni bir daha əbədiləşdirdi. **Ali Baş Komandan**ımız **Prezident** İlham Əliyevin 28 May - Respublika Günü ilə bağlı paylaşımda dediyi kimi: **«Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan bugünkü Azərbaycan dövləti xalqımızın müstəqillik arzularını gerçəkləşdirdi. Əminəm ki, bizim müstəqillik inkişafımız davamlı olacaq və Azərbaycanın dövlət müstəqilliyi əbədi yaşayacaq».**



## MÜASİR AZƏRBAYCAN DÖVLƏTİ HEYDƏR ƏLİYEVİN HƏYAT AMALININ TƏNTƏNƏSİDİR

Azərbaycan hər ili tarixi hadisəyə çevrilən və yaddaşlarda həkk olunan 2023-cü ilə də uğurla qədəm qoymaqla tariximizə xüsusi bir əlamətdarlıq ili kimi yazılmaqdadır. Çünki bu ili fərqli ovqatla, qalib ölkənin qalib xalqı qalib kimi böyük qürur və fəxarətlə **Ulu öndər Heydər Əliyevin** anadan olmasının 100-cü ildönümünü qeyd edirik.

**Prezident** İlham Əliyevin mayın 10-da Azərbaycan xalqının Ümummilli lideri, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasi və dövlət xadimi **Heydər Əliyevin** anadan olmasının 100 ili ilə bağlı 2023-cü ilin **Heydər Əliyev** ili olmasını xalqımız böyük sevinc və fəxarətlə qarşıladı. Sərəncamda deyildiyi kimi: **"Çünki Heydər Əliyev öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir".** Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz **Heydər Əliyev** zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan **Heydər Əliyevin** həyat amalının təntənəsidir. Belə Azərbaycana rəhbərliyinin birinci dövründə **Heydər Əliyev** özünün qeyri-adi idarəçilik bacarığı, polad iradəsi və yüksək vətənpərvərliyi sayəsində, uzaqgörən və məqsədyönlü qərarları ilə çox qısa müddətdə respublikamızda sosial-iqtisadi, elmi-texniki və mədəni sahələrin inkişafında böyük sıçrayışa nail olmuşdur.

Ümummilli lider **Heydər Əliyev** öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz **Heydər Əliyev** zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan **Heydər Əliyevin** həyat amalının təntənəsidir.

## ULU ÖNDƏR HEYDƏR ƏLİYEV MÜSTƏQİL DÖVLƏTİMİZİN TARİXİNİ YARADIB VƏ ƏN ŞANLI SƏHİFƏLƏRİ DƏ MƏHZ ONUN ADI İLƏ BAĞLIDIR

Sirr deyil ki, Azərbaycan xalqının Ümummilli Lideri **Heydər Əliyev** fəaliyyətinin hər bir məqamı ilə xalqın, dövlətin, cəmiyyətin və onun üzvlərinin mənafeyinə xidmət edib, Azərbaycan dövlətinin və xalqının bütövlüyü uğrunda fədakarlıqla çalışıb, müstəqilliyimizin möhkəmləndirilməsi, dövlətçiliyimizin inkişafı, demokratiyanın genişləndirilməsi, xalqın rifah halının daha da yaxşılaşdırılması üçün mümkün ola bilən hər bir işi gerçəkliyə, reallığa çevirib. **Ulu öndər Heydər Əliyev** aramızda cismən olmasa da, qəlbimizdə yaşamaqda, yaşadılmaqdadır. Bu baxımdan, **Heydər Əliyev** Azərbaycan xalqının əbədiyaşar Lideridir.

Bütün həyatını Azərbaycanın və xalqın taleyi ilə bağlayan **Heydər Əliyev** bənzərsiz və müqayisəolunmaz şəxsiyyət idi. **Ulu öndər** müstəqil dövlətimizin tarixini yaradıb və ən şanlı səhifələri də, məhz Onun adı ilə bağlıdır. Ümummilli Liderimiz demokratiyanın həm ideoloqu, həm təşkilatçısı, həm də icraçısı idi. O, Azərbaycanın nüfuzunu bütün dünyada yetərincə qaldırıb.

Bu real həqiqətdir ki, **Heydər Əliyev** birinci dəfə Azərbaycana rəhbərliyə gələndə ölkəmiz geridə qalmış bir respublika idi. **Ulu öndər** rayonlara səfər edir, adamlarla görüşür, onların problemlərini öyrənir, bir sözlə, sosial infrastrukturun geridə qalma səbəblərini araşdırırdı. Dahi şəxsiyyət tikinti-quruculuq işlərinə xüsusi əhəmiyyət verirdi. Orta və yaşlı nəslin nümayəndələri yəqin ki, yaxşı xatırlayırlar. O illərdə Azərbaycanın elə bir şəhəri, rayonu, qəsəbəsi, kəndi yox idi ki, orada tikinti-quruculuq işləri aparılmasın. Yollar çəkilir, məktəblər, xəstəxanalar, yaşayış binaları tikilirdi. **Heydər Əliyevin** xoşbəxtliyi onda idi ki, xalq tərəfindən sevilirdi, fitri istedadı, idarəetmə qabiliyyəti vardı. O, bütün həyatını Azərbaycanın çiçəklənməsinə, qüdrətlənməsinə, insanların firavan yaşamasına həsr etmişdi. **Heydər** Əliyevi nadir dövlət xadimi kimi uca zirvəyə qaldıran, xalqın ümummilli liderinə çevirən keyfiyyətlərindən birincisi, Onun xalqına qırılmaz tellərlə bağlı olması idi. **Ulu öndər** həmişə Azərbaycanlı olması ilə fəxr edirdi. Ölkəmizin bu illər ərzində əldə etdiyi tarixi



uğurlar məhz dahi şəxsiyyət, əbədiyaşar Lider **Heydər Əliyevin** adı ilə bağlıdır.

**Müdrikliyin düha fəlsəfəsi:**

**Ulu öndər Heydər Əliyevin** adı və şərəfli həyatı öz Vətəninə, xalqına məhəbbətin təkrarsız təcəssümü, millətə və dövlətə xidmətin misilsiz nümunəsi kimi əsrlər boyu yaşayacaq, Azərbaycanın indiki və gələcək nəsilləri üçün əbədi örnək olacaqdır. Dahi şəxsiyyət canından çox sevdiyi xalqına möhkəm dövlətçilik təsisatlarına malik, demokratik və bəşəri dəyərlərə sadiq, dünya birliyində layiqli yer tutan müasir müstəqil Azərbaycan bəxş etdi.

Ölkəmizin qazandığı bütün uğur və nailiyyətlər, inkişaf və tərəqqi, xalqımızın milli dəyərlərinin qorunması **Heydər Əliyev** dühasının bəhrəsidir. Azərbaycan xalqı çox xoşbəxtik ki, onun qismətinə Onun kimi dahi və nadir şəxsiyyətlə, qüdrətli lider və dövlət rəhbəri ilə eyni dövrdə yaşamaq səadəti düşmüşdür. Bu gün təkcə xalqımız deyil, həm də dünya şöhrətli siyasətçilər, tarixçilər və politoloqlar Ümummilli Liderimiz **Heydər Əliyev**i müasir müstəqil Azərbaycan dövlətinin həqiqi memarı və yaradıcısı sayır.

XX-XXI əsrlərin qovuşuğunda Azərbaycanın demokratik və



bəşəri dəyərlərə sadiq, müstəqil bir dövlət kimi formalaşması böyük öndərimizin titanik siyasi fəaliyyətinin nəticəsidir. **Heydər Əliyev** şəxsiyyətinin və siyasi fəaliyyətinin beynəlxalq səviyyədə yüksək qiymətləndirilməsi, adının bəşər tarixində əbədi iz qoymuş dövlət xadimləri ilə bir sırada çəkilməsi bizim üçün hədsiz qürur və iftixar mənbəyidir. **Ulu öndərimizin** xalqımızın və dövlətimizin tarixində, taleyində təkrarolunmaz rolu bizə haqq verir ki, Onu Azərbaycanın bütün dövrlərdə yetişdirdiyi şəxsiyyətlərin ən ucası adlandıraq.

**Ulu öndər Heydər Əliyevin** adı bu gün sözün həqiqi mənasında Azərbaycan dövlətinin rəmzi kimi səslənir. Bugünkü güclü, qüdrətli Azərbaycanı O, öz əlləri ilə yaradıb, onun müstəqilliyini yaşadıb, inkişaf etdirib, bütün dünyaya tanıdıb.

Ümummilli Liderin ərmağan qoyub getdiyi zəngin irsi bu gün də, sabah da, gələcəkdə də daim öyrənilməli, onun əsas mahiyyəti dərk edilməlidir. Bu zəngin irs müstəqil Azərbaycan dövlətinin sütun dirəkləridir. Məhz bu qüdrətli sütunlar üzərində ucalan müa-

sir Azərbaycan güclü ola bilib. İctimai həyatımızın elə bir sahə və istiqamətini tapmaq mümkün deyil ki, orada **Heydər Əliyevin** izi, hərarəti duyulmasın. **Ulu öndərimizin** uzaqgörənliklə müəyyənləşdirdiyi, konseptual əsaslarını yaratdığı xarici və daxili siyasət kursu, milli neft strategiyası bu gün öz bəhrələrini verir. «Əsrin müqaviləsi» çərçivəsində reallaşan Bakı-Tbilisi-Ceyhan neft, Bakı-Tbilisi-Ərzurum qaz kəmərləri layihələri **Heydər Əliyevin** milli neft strategiyasının təntənəsi, Azərbaycanın xoşbəxt gələcəyinin möhkəm bazası və möcüzəli açarıdır.

**Ulu öndər Heydər Əliyev** həm də zəmanəmizin böyük strateq və siyasətçisi kimi tanınıb. Onun formalaşdırdığı və həyata keçirdiyi azərbaycançılıq ideologiyası Azərbaycanın müasir dünyada xüsusi yerini müəyyən etmiş, dünya azərbaycanlılarının bir ideya ətrafında birləşməsinə, həmrəylik nümayiş etdirməsinə səbəb olmuşdur. Təsadüfi deyil ki, dünyanın bir çox görkəmli dövlət başçıları və ictimai xadimləri, nüfuzlu politoloqları ümummilli liderimiz barədə yüksək fikirlər söyləmişlər.

Türkiyənin sabiq **prezident**i Süleyman Dəmirəl **Ulu öndər**imiz **Heydər Əliyev**i **«Azərbaycan xalqının nicatı üçün bir şans, canını Vətəni və xalqı yolunda sipərə çevirən qeyrətli oğul»** - adlandırıb.

Dünyanın ən məşhur dövlət xadimlərinin portretlərini çəkmiş görkəmli rəssam Nikos Safronov **Heydər Əliyevin** 80 illik yubileyi münasibətilə portretini çəkərkən dahi rəhbərimizlə ünsiyyətdə olduqdan sonra bu qənaətə gəlmişdir ki, Heydər Əlirza oğlu Əliyev Tanrının yaratdığı mövcüzədir, belə şəxsiyyətlər min ildə bir dəfə dünyaya gəlir.

Azərbaycanın bu günkü və gələcək nəsillərinin **Heydər Əliyevin** şərəfli adı, ölməz ruhu qarşısında müqəddəs borcu Onun şah əsəri olan müstəqil Azərbaycan dövlətinin daha da çiçəklənməsi və qüdrətlənməsi, xalqımızın rifahı naminə fədakarlıqla çalışmaq, milli birliyimizə sədaqətlə xidmət göstərməkdir. Onun nurlu xatirəsi qəlbimizdə, yaddaşlarda əbədi yaşayacaqdır. **Ulu öndər** müdriklik simvolu idi. Dahi və bənzərsiz şəxsiyyət **Heydər Əliyevin** ideyaları həyatımızın hər sahəsinə işıq salır, bizə yol göstərir.




## ÜMUMMİLLİ LİDERİ HEYDƏR ƏLİYEV İRSİNƏ SƏDAQƏTLİLİK

Ümumilli Liderin bizlərə qoyduğu ərməğan möhkəm təməllərə əsaslanmışdır. **Prezident**i İlham Əliyevin rəhbərliyi altında gələcəyə addımlayırıq. **Prezident** İlham Əliyev Azərbaycan xalqının dahi oğlu **Heydər Əliyevin** demokratik, hüquqi və dünyəvi dövlət quruculuğu siyasətini uğurla davam etdirir. Ölkədə iqtisadi islahatlar daha da sürətlənmiş, xüsusi **Prezident** fərmanı ilə regionların sosial-iqtisadi inkişafına dair Dövlət proqramları qəbul olunmuşdur. **Prezident** İlham Əliyev ölkədə insan haqları və azadlıqlarının daha dolğun təmin olunmasını daim diqqət mərkəzində saxlayır.




## DÜNƏNDƏN BU GÜNƏ BAXIŞ

Təməli hələ 1993-cü ildə Ümummilli Liderimiz **Heydər Əliyev** tərəfindən qoyulmuş xarici və daxili siyasət kursunun dəyişməz olduğu, bu siyasətin yalnız milli maraqlar çərçivəsində aparıldığı göz qabağındadır. Bu siyasət ölkə **Prezident**i İlham Əliyev tərəfindən qloballaşan bəşəriyyətin tələblərinə uyğun olaraq yeni məzmun və keyfiyyətdə uğurla davam etdirilir.

Eyni zamanda, Azərbaycan xalqının və dövlətçiliyinin xilaskarı və yaradıcısı olan Ümummilli Lideri, **Ulu öndər Heydər Əliyev** irsini daim öyrənirik.



## 27 SENTYABR - QƏLƏBƏYƏ APARAN 44 GÜNLÜK YOLUN BAŞLANĞICIDIR

Azərbaycan Respublikasının **Prezident**i İlham Əliyevin 2 dekabr 2020-ci il tarixli Sərəncamı ilə hər il sentyabrın 27-sinin Azərbaycan Respublikasında Anım Günü kimi qeyd edilməsi qərara alınıb. Artıq, 3-cü ildir ki, xalqımız torpaqlarımızın bütövlüyü uğrunda canını fəda etmiş şəhidlərimizin xatirəsini uca tutaraq Anım Gününü qeyd edir. Vətən müharibəsində qəhrəmancasına döyüşmüş, Azərbaycan Bayrağını işğaldan azad edilən torpaqlarımızda dalğalandırmış, ölkəmizin ərazi bütövlüyü yolunda canlarını fəda etmiş əsgər və zabitlərimizə, bütün şəhidlərimizə dərin ehtiram əlaməti olaraq, Azərbaycan Respublikasının **Prezident**i, **Ali Baş Komandan** İlham Əliyev 27 sentyabrı Anım Günü kimi bəyan etməklə, xalqımızı bu günün işığında bir daha birləşdirdi. Artıq 3-cü ildir ki, xalqımın Anım

gününü kədərdən, üzüntüdən daha çox qürur, mərdlik günü kimi qeyd edir.

**Prezident** İlham Əliyev 27 sentyabr 2020-ci il tarixdə xalqa müraciətində bildirirdi ki, «Bizim mövqeyimiz beynəlxalq hüquqa və ədalətə əsaslanır. Biz öz torpağımızda vuruşuruq. Bu gün Azərbaycan Ordusu Azərbaycan torpaqlarında düşmənə sarsıdıcı zərbələr endirir. Bu gün Azərbaycan Ordusu öz torpağında Azərbaycanın ərazi bütövlüyünü qoruyur, müdafiə edir. Erməni əsgərinin bizim torpağımızda nə işi var?! Ermənistan ordusunun bizim torpağımızda nə işi var?! Heç kəs üçün sirr deyil ki, «dağlıq qarabağ ordusu»nun tərkibində olan şəxsi heyətin 90 faizi Ermənistan vətəndaşlarından ibarətdir. Ermənistan işğalçı dövlətdir, bu işğala son qoyulmalıdır və son qoyulacaqdır. Biz haqq yolundayıq. Bizim işimiz haqq işidir. Biz zəfər çalacağıq! Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!».

Çünki 27 sentyabrdan qələbəyə gedən yol cəmi 44 gün davam etdi. Və 44 gün davam edən İkinci Qarabağ müharibəsində siyasi, hərbi, diplomatik uğurları ilə beynəlxalq ictimaiyyəti heyrətləndirən Azərbaycan mənfur düşmənə layiq olduğu yeri göstərdi. Bir daha sübut olundu ki, başqasının torpaqlarına göz dikən, saxta tarix yazaraq əsassız təbliğatları ilə özünü haqlı tərəf kimi göstərməyə çalışan təcavüzkar dövlətin aqibəti «Dəmir yumruğ»un başlarına dəyərək əzilməsi, əyilməsi, diz çökərək kapitulyasiya olmasıdır. Azərbaycan 30 il dünyanın ikili standartlara əsaslanan siyasəti ilə üz-üzə qalsa da heç zaman haqlı mübarizəsindən geri dönmədi. **Ali Baş Komandan**ımız ən yüksək tribunalardan erməni yalanlarını ifşa etdi, dünyaya sözün əsl mənasında tarix, hüquq və milli qürur dərsi keçdi. Təəssüflər olsun ki, əksər dünya gücləri, nüfuzlu beynəlxalq təşkilatlar bu realllıqları dərk etmək istəmədilər. Və Ermənistan bu dəstəyə o qədər arxalandı ki, yeni ərazilər uğrunda müharibə planları hazırladı və 2020-ci ildə mütəmadi olaraq hərbi təxribatlar törətməklə bu planını açıq-aşkar büruzə verdi. İkinci Qarabağ müharibəsi başlamadan əvvəl, sentyabrın 24-də BMT Baş Assambleyasının 75-ci sessiyasının ümumi debatlarında videoformatda çıxışı zamanı Azərbaycan **Prezident**i İlham Əliyev bu tribunadan dünyaya Ermənistanın müharibə planı hazırladığını çatdırdı. Dünya gücləri bunu eşitsə də susmağa üstünlük verdilər. 27 sentyabr 2020-ci ildə Ermənistan silahlı qüvvələrinin müxtəlif istiqamətlərdən Azərbaycan ərazilərini raket atəşinə tutmaları

İkinci Qarabağ müharibəsinin baş verməsinə səbəb oldu. Və başlanan İkinci Qarabağ müharibəsində igid oğullarımız **Ali Baş Komandan**ın «Dəmir yumruq» siyasəti ilə canları, qanları ilə Zəfər tarixini yazdılar. Və bir daha sübut etdilər ki, torpağımızın 30 il bu murdar işğalçılardan xilas etmək üçün, haqqımızın, ərazi bütövlüyümüzün bərqərar olması üçün Zəfər uolunda şəhid olaraq, yenilməz, məğrur xalq olduqlarını dünyaya nümayiş etdirdilər. Qazanılan Zəfər təkcə silahın gücü deyil, **Prezident**in, millətin liderinin milli maraqlarımıza söykənən müstəqil siyasətinin, beynəlxalq arenada yüksək nüfuzunun məntiqi nəticəsi idi. Və bir daha **Ali Baş Komandan**, **Prezident** İlham Əliyevin 27 sentyabr Anım Günündə xalqa etdiyi müraciət bizi hər an Qalib xalq olaraq bir daha duyğulandırır, qürurlandırır! Bu müraciəti dinlədikcə bir daha **Ali Baş Komandan**ımızla, şəhidlərimizlə, qazilərimizlə, Ordumuzla, bütövlükdə xalqımızla qürur duyuruq. Dövlət başçısı, **Müzəffər Ali Baş Komandan** İlham Əliyev müraciətində ilk növbədə şəhidlərimizi – canı, qanı bahasına bu qələbənin qazanılmasında iştirak etmiş əsgər və zabitlərimizi hörmət və ehtiramla andı. Əsgər və zabitlərimizin qəhrəmanlığını, igidliklərini yüksək dəyərləndirdi.

**Prezident** İlham Əliyev geniş və əhatəli müraciətində olduqca mühüm məqamlara toxundu, önəmli mesajlar verdi: «Dağlıq Qarabağ münaqişəsi tarixdə qaldı. Azərbaycanda «Dağlıq Qarabağ» adlı inzibati ərazi mövcud deyil və əgər kimsə «Dağlıq Qarabağ» adlı ölünü diriltmək istəyirsə, onu öz ərazisində diriltsin, öz ərazisində «dağlıq qarabağ» adlı qurum yaratsın, respublika yaratsın, cəmiyyət yaratsın», «44 gün ərzində biz təkcə öz ərazi bütövlüyümüzü bərpa etmədik, təkcə düşməni torpağımızdan qovmadıq, təkcə milli ləyaqətimizi bərpa etmədik, biz erməni faşizminin başını əzdik», «44 gündən sonra – artıq Ermənistan ordusunun beli qırılandan, biz alınmaz qala sayılan Şuşanı və ardınca 70-dən çox kəndi işğalçılardan azad edəndən sonra düşmən məcbur qalıb təslim olub. Bu dərs əbədi dərsdir, bunu heç kim yaddan çıxarmasın!», «Mən demişdim, onların qanı yerdə qalmayacaq və qalmadı. Biz onların qanını aldıq! Mən demişdim ki, biz onların qisasını döyüş meydanında alacağıq, belə də oldu. Bu Qələbəni bizə bəxş edən qəhrəman əsgər və zabitlərimiz bizim qürur mənbəyimizdir. Onların qəhrəmanlığı, onların şücaəti, fədakarlığı artıq dastana çevrilib», «Bu gün Anım Günündə şəhidlərimizin əziz xatirəsi önündə bir daha deyirəm, əgər biz görsək ki, erməni faşizmi baş qaldırır, əgər



biz görsək ki, xalqımıza, dövlətimizə yeni təhlükə mənbəyi yaranır, heç tərəddüd etmədən erməni faşizminin başını bir daha əzəcəyik. Bunu hər kəs bilsin! Müharibənin və Qələbənin rəmzi olan «Dəmir yumruq» yerindədir, bunu heç kim unutmasın!».

Beləliklə, **Ali Baş Komandan**ın Anım Günü ilə bağlı etdiyi müraciətdə səsləndirdiyi cəsarətli fikirlər həm də dünya güclərinə bir çağırış oldu. Ölkə başçısı hər bir dövlətin ərazi bütövlüyünə, daxili siyasətinə hörmətlə yanaşırıq, daxili işlərinə qarışmırıq, sizlər də bizim kimi davranın mesajını vermiş oldu. Və bundan sonra biz qalib ölkə, qalib xalq olaraq daim **Müzəffər Ali Baş Komandan**ın ətrafında «Dəmir yumruq» kimi birləşəcək, çiçəklənən ölkəmizi birlikdə qoruyacağıq. Dövlət başçımızın söylədiyi kimi: **«Bunu hər kəs bilsin! Müharibənin və Qələbənin rəmzi olan «Dəmir yumruq» yerindədir, bunu heç kim unutmasın!».**



**"Dəmir yumruq" yerindədir və hər zaman yerində olacaq!**

44 günlük İkinci Qarabağ müharibəsində dünya hərb tarixinə yeni səhifə yazan yenilməz Azəbaycan Ordusu növbəti qələbəyə imza atdı. Belə ki, **Müzəffər Ali Baş Komandan**, **Prezident** İlham Əliyev cənablarının «Dəmir Yumruq» siyasəti ilə Güclü Ordumuzun əsgər və zabitləri Azərbaycanın Qarabağ iqtisadi rayonunda keçirdiyi daha bir böyük missiyanı uğurla başa çatdıraraq separatçıları təslim olmağa məcbur etdi. Ölkəmizin qısa müddətdə, bir günə təmin etdiyi qələbə yenilməz Ordumuzun malik olduğu imkanların olduğunu və

Azərbaycanın müstəqilliyinə, suverenliyinə qarşı bütün təxribatların qarşısı qətiyyətlə alınır və alınacağının sübutu idi.

**Müzəffər Ali Baş Komandan**, **Prezident** İlham Əliyevin 20 sentyabr tarixində növbəti tarixi qələbəmizlə bağlı xalqa müraciəti dünyanın harasında yaşamağımızdan asılı olmayaraq bütün dünya azərbaycanlılarını qürurlandırdı. Və bir daha bütün dünyaya sübut etdi ki, bir gündə – 24 saat ərzində antiterror tədbirlərinin başlanması və bir gün ərzində uğurla başa çatması nəticəsində Azərbaycan öz suverenliyini bərpa etdi. şücaət, peşəkarlıq göstərdilər: «Dünən təxminən saat 13:00 radələrində antiterror tədbirlərinin başlanması və uğurla başa çatması nəticəsində Azərbaycan öz suverenliyini bərpa etmişdir».

Qalib Liderimiz, **Prezident** İlham Əliyev müraciətində lokal antiterror tədbirlərinə başlanmasını şərtləndirən amillərə diqqəti yönəldərək bildirdi ki, bu tədbirlər nəticəsində hərbçilərimiz böyük qəhrəmanlıq, şücaət, peşəkarlıq göstərdiklərini qeyd edən dövlətimizin başçısı deyib: «Ağır relyef şəraitində, düşmən tərəfindən uzun illər böyük mühəndislik işləri nəticəsində istehkamların mövcudluğu şəraitində, düşmən mövqelərinin təpələrdə, əlverişli yerlərdə yerləşdirilməsinə baxmayaraq, bizim hərbçilərimiz qəhrəmanlıq, peşəkarlıq göstərmişlər və qısa müddət ərzində bütün istiqamətlər üzrə əhəmiyyətli dərəcədə hərbi uğurlar əldə etmişlər. Ermənistan dövlətinin Azərbaycan ərazisində qanunsuz yerləşdirilmiş və Ermənistan dövlətinin öhdəliyinə baxmayaraq, bu günə qədər çıxarılmamış ordunun böyük hissəsi tamamilə məhv edilmişdir. Hərbi texnika məhv edilmişdir və sıradan çıxarılmışdır».

Dövlət başçımız **Prezident** İlham Əliyev xalqa müraciətində bir daha özlüyündə yaranan «Bu vəziyyətə gətirib çıxarmaq kimə xeyir gətirdi» sualına cavab olaraq bildirdi ki, İkinci Qarabağ müharibəsindən dərhal sonra biz haqlı narahatlığımızı ifadə edərək dəfələrlə Ermənistan rəhbərliyinə, onların xaricdəki havadarlarına və digər tərəflərə müraciət edərək deyirdik ki, Ermənistan silahlı qüvvələrinin Azərbaycan ərazisində qalması qanunsuzdur və buna son qoyulmalıdır: «Biz deyirdik ki, qanunsuz xunta rejimi öz əski parçasından artıq olmayan dırnaqarası bayraqlarını büküb cibinə qoyub bizim torpağımızdan çıxmalıdır. Bu, bizim suveren hüququmuzdur. Qarabağ Azərbaycan ərazisidir və bunu bütün dünya

tanıyır, o cümlədən Ermənistan rəhbərliyi artıq bunu başa düşüb. Əgər vaxtilə «Qarabağ Ermənistandır və nöqtə» deyirdisə, indi «Qarabağ Azərbaycandır» deyir və nəinki deyir, hətta bizim ərazimizin ölçülərini də dilə gətirməyi unutmur. Düzdür, bunu öz xoşu ilə etməyib, bunu «Dəmir yumruq» hesabına etməyə məcbur olub. Amma fakt göz qabağındadır. Ermənistan Qarabağı Azərbaycanın ayrılmaz hissəsi kimi tanıyandan sonra Qarabağda 30 il at oynadan kriminal rejimin hansı statusu ola bilər?! Hansı dövlət atributları ola bilər?! Hansı seçkilər ola bilər?!».

Dövlət başçımız sözügedən müraciətdə onu da söylədi ki, İkinci Qarabağ müharibəsi başa çatanda, Ermənistan ağ bayraq qaldıranda, diz çökəndə, kapitulyasiya aktına imza atanda mən demişdim ki, status cəhənnəmə getdi. Ona görə bütün bu amillər bir daha onu göstərir ki, qanunsuz kriminal xunta rejimi azğınlaşıb, harınlaşıb və qudurub. Unudub ki, onlar Azərbaycan ərazisində yaşayırlar. Ona görə bizim bütün addımlarımız legitimdir, hüquqidir, ədalətlidir və bütün addımlara görə biz həm məsuliyyət daşıyırıq, həm qürur hissi keçiririk: **«Hesab edirəm ki, dünən və bu gün baş vermiş hadisələr, eyni zamanda, Azərbaycanla Ermənistan arasında gedən sülh prosesinə də müsbət təsir göstərəcək».**

Bəli, dövlət başçımızın müraciətində sölədiyi kimi: **«O gün uzaqda deyil - Azərbaycan və Ermənistan öz aralarında olan məsələləri tənzimləyəcək, sülh müqaviləsi imzalayacaq və Cənubi Qafqaz ölkələri üçtərəfli formatda gələcək əməkdaşlıq haqqında işləməyə başlayacaqlar. Ancaq bununla bərabər, onu da bildirməliyəm ki, bizə xor baxanlar, torpağımıza göz dikənlər, uğurumuzu həzm edə bilməyənlər heç vaxt, heç vaxt unutmasınlar ki, «Dəmir yumruq» yerindədir və hər zaman yerində olacaq! Heç kim bizimlə diktat və ultimatum dilində danışa bilməz! Bunu heç kim unutmasın! Onu da unutmasın ki, Qarabağ Azərbaycandır!».**



## MÜSAHİBƏ VƏ ŞƏRHLƏR

**Zərifə Quliyeva: Heydər Əliyev** müstəqil, güclü, demokratik ölkəmizin fundamentini od-alovun içərisindən çıxararaq qurmuşdur. **15 İyun əsl qurtuluş tarixi, Azərbaycan xalqının ölüm-dirim mübarizəsinin tarixidir.**

**Milli.xəbər.az 15.06.2020**

15 iyun Milli Qurtuluş günü münasibəti ilə “Qurtuluş tariximizdə **Ulu öndər Heydər Əliyevin** yeri və rolu” mövzusunda **Millxəbər. az**-ın əməkdaşları YAP keçmiş Qadınlar Şurasının İdarə Heyətinin üzvü, hazırda YAP Veteranlar Şurasının üzvü, “Modern ailə və inkişaf ” İctimai Birliyinin sədri, Zərifə xanım Quliyeva ilə etdiyimiz ictimai-siyasi əhəmiyyətli müsahibəni təqdim edir.

**–Zərifə xanım, Ümummilli liderimiz Heydər Əliyevin ölkəmizə rəhbərlik etdiyi hər iki dövrdə idarəçilikdə işləmiş,eyni zamanda ictimai-siyasi fəal Azərbaycan qadını olaraq, 15 İyun Milli Qurtuluş Günü ilə bağlı danışarkən istərdik ki, Heydər Əliyevin qadınların ictimai-siyasi fəaliyyətdə rolunun artırılması yönümündə gördüyü işlərdən və bu siyasi xəttin bu günkü davamından söz açasınız.**

-Tarixdə elə günlər, elə hadisələr var ki, böyük bir xalqın, bir ölkənin taleyini müəyyənləşdirir, yeni bir dövrün, həlledici mərhələnin başlanğıcı, istinad nöqtəsi olur. Müxtəlif tarixi hadisələrlə əlamətdar olan 15 İyun Milli Qurtuluş günüdür. Tariximizdə Milli Qurtuluş xalqımız üçün çox dəyərlidir. Milli Qurtuluş Günü sadəcə təqvimdə göstərilən bayram deyil. O, həmçinin, böyük ictimai- siyasi və tarixi sevən, həmin çətin, ağrılı günlərin dəhşətlərini yaşayan, hadisələri gözləri ilə görən insanlar üçün 15 İyun əsl qurtuluş tarixi, Azərbaycan xalqının ölüm- dirim mübarizəsinin tarixidir. Bu tarixi yaradan isə Azərbaycanın inkişafında,müstəqilliyində, gələcəyində müstəsna rol oynayan, daim xalqına arxalanan və xalqına arxa- dayaq olan dahi şəxsiyyət Heydər Əlirza oğlu Əliyevdir.

**Ulu öndər** haqqında danışmaq həm çətindir, həm də şərəflidir. Tarixi şəxsiyyət **Heydər Əliyevin** böyüklüyü həm də ondadır ki, hakimiyyətin ona qarşı həyata keçirdiyi təxribatlara, qarayaxma kampaniyasına baxmayaraq, daim xalqının yanında oldu. Azərbaycanın layiqli övladının xalqının çağırışı və dəvəti ilə hakimiyyətə gələn, Qurtuluş dəvəti ilə missiyalı bu qayıdışı Azərbaycan xalqının itirilmiş inamını özünə qaytardı, sabaha, gələcəyə olan ümidini artırdı. Məhz,Ümummilli Liderimiz **Heydər Əliyevin** ikinci dəfə siyasi hakimiyyətə qayıdışından sonra ölkədə ilk demokratik **prezident** seçkiləri keçirildi. 1993 – cü il oktyabrın 3 – də İqtisadi islahatların həyata keçirilməsi istiqamətində böyük addımlar atıldı.

**Heydər Əliyev** elə bir şəxsiyyətdir ki, onunla bağlı günlər və aylarla danışmaq bəs etməz. Mən özümü xoşbəxt qadın hesab edirəm ki, **Ulu öndərin** hər iki hakimiyyəti dövrünü görmüş və idarəçilikdə çalışmışam. Sovetlər dönəminin də öz çətinlikləri var idi.**Heydər Əliyev** bu çətinliklərin qarşısında dağ kimi dayanırdı. Xalqımız bu qurtuluşa asanlıqla nail olmadı, çox böyük çətinliklərdən, bir sıra dəhşətli hadisələrdən sonra əldə edə bildi. Ən böyük qurtuluşumuz **Heydər Əliyevin** yenidən Azərbaycana rəhbər olması ilə oldu. Qurtuluş günü xalqımız üçün ən dərin, ən keyfiyyətli bir bayramdır.Qurtuluş günü ilə xalqımız ağ günə çıxdı. Qurtuluşa qədər Azərbaycan yanır,dağılır, parçalanırdı. Sözün əsl mənasında Azərbyacan xalqı atəş içində yanıb kül olurdu sanki… Belə bir çətin dövrdə ləyaqətli Azərbaycan xalqı üz tutdu öz liderinə… Xalq yaxşı bilirdi ki, onları bu zülmətdən,qaranlıqdan, tilsimdən,

yalnız, **Heydər Əliyev** çıxarıb aydınlığa doğru apara bilər.

Azərbaycan xalqı hər zaman yanan və dağılan vaxtda **Ulu öndər**ə üz tutub. O deyərdi ki, "Son damla qanıma qədər xalqıma xidmət edəcəyəm"

Bilirsiniz! Tariximizdə önəmli günlərdən biri də Azərbaycan Xalq Cümuhuriyyətidir. Xalq cümhuriyyəti niyə uzun yaşamadı?. Ona görə ki, o dövrdə yüksək vəzifədə çalışanların sırasında "erməni daşnakları,rus bolşevikləri"... Bunlar imkan vermədilər ki, cümhuriyyətin ömrü uzun olsun! Onlar bilavasitə, özlərinin şovnist niyyətlərini həyata keçirməklə məşğul idilər.Təəssüflə qeyd etmək istərdim ki, bu siyasi proseslər sovet hakimiyyəti dövründə də davam etdirilirdi. Bütövlükdə, Cümhuriyyət xalqımızın müstəqillik tarixində önəmli yer tutur.Hər kəsə bəllidir ki, Ümummilli lider **Heydər Əliyev** Naxçıvanda Ali Məclisə rəhbərlik etdiyi dövrdə cümhuriyyətdən bizə miras qalan üç rəngli bayrağımızı ilk dəfə qəbul edərək yenidən dalğalandırdı. **Ulu öndər Heydər Əliyev** Azərbaycana ikinci dəfə rəhbərliyə gəldikdən sonra müstəqillik tariximizin varisi kimi qəbul etdiyimiz Azərbaycan Xalq Cümhuriyyətinə böyük diqqət və qayğı ilə yanaşmışdır. Elə, onun nəticəsidir ki,ölkəmiz hər il cümhuriyyət günü ilə bağlı bir çox tədbirlər keçirir və yüksək səviyyədə bu əlamətdar günü qeyd edir.Sevindirici haldır ki, bu ənənə hörmətli **Prezident**imiz cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Cümhuriyyətin qurucularından biri Məhəmmədəmin Rəsulzadənin üç rəngli bayrağımızla bağlı belə bir kəlamı var. "Bir kərə yüksələn bayraq bir daha enməz". Mən isə hər yerdə deyirəm və belə hesab edirəm ki, **Ulu öndərimizin** gücü ilə yüksəkliyə qalxan, möhtərəm **Prezident**imiz İlham Əliyevin siyasəti ilə dünya ölkələrində uca zirvələrə qaldırılan üç rəngli bayrağımız əsirlər boyu heç vaxt enməz.

**Heydər Əliyev** hələ sovetlər birliyi dövründə, Azərbaycanda birinci katib olduğu dövrdə qadınların ictimai-siyasi proseslərdə iştirak etmələrinə xüsusi fikir verirdi.O dövrdə kalxoz və savxozlarda çalışan əməkçi qadınların Ali sovetə deputat seçilməsi üçün hər cür şərait yaradırdı.Sovetlər birliyinin kəskin dövründə Onun qədər gender bərabərliyinə fikir verən belə bir rəhbər şəxslər çox az idi. **Heydər Əliyev** hələ sovetlər birliyi dövründə deyərdi ki, qadınlarla kişilər bərabər hüquqlu olmalıdırlar.

**Heydər Əliyev** ikinci dəfə xalqın tələb və təkid istəyi ilə rəhbərliyə



gəldikdən sonra qadınlarla bağlı gender siyasətini uğurla davam etdirdi. İlk dəfə o zamankı Ali sovetdə 20 Yanvar faciəsinə siyasi qiymət verdi. Erməni qəsbkarları tərəfindən törədilmiş Xocalı soyqırımını və işğal edilmiş torpaqlarımızın bizə məxsusluğunu bir əlində xəritə, bir əlində xətkeş bəyan edərək dünyaya tanıtmağa nail olurdu.**Heydər Əliyev Prezident** seçildikdən sonra bir sıra uğurlu yeniliklər etdi.1995-ci ildə ilk dəfə Milli Məclisə seçkilər keçirildi. **Ulu öndərin** təklifi ilə qadınların Millət vəkili olmaları vacib bilindi,ictimai-siyasi proseslərdə qadınların fəallığına geniş meydan verildi. Onu da vurğulayım ki, bu cür təqdirəlayiq işlərin ardıcıl aparılması Parlamenti aydınlatdı, bununla da parlament mənfur insanlardan təmizləndi.Onu da deyim ki, buna qədər Parlament üzvlərinin böyük əksəriyyəti kişilərdən ibarət idi. Parlament yeniləndikdən sonra qadınlar,uşaqlar,kimsəsizlər haqqında çox böyük qanunlar qəbul edildi. Ümumiyyətlə, hər bir sahədə qadın kişi bərabərliyi olduqca vacibdir.Milli məclisdə elə qanunlar var ki, o qanunlara qadınların təklif və münasibət bildirməsi bu qanunun daha mükəmməl olmasında çox böyük rol oynayır.Qadın hümanistliyi,təkcə zərif olmağı ilə deyil eyni zamanda qadınlar ailədə ,cəmiyyətdə xüsusi funksiyaya malikdirlər.Bu baxımdan qadın Parlamentarilərin olması

olduqca vacibdir.

**Ulu öndər** çıxışı zamanı demişdir ki, dünyanın hər bir yerində olmuşam. Azərbaycan qadınları kimi sədaqətli, gözəl, bilikli qadın görməmişəm. O deyərdi ki, hər bir irəliyə doğru gedən kişinin arxasında savadlı,iradəli,təmkinli qadın olmalıdır. Bu gün fəxrlə deyə bilərik ki, Böyük şəxsiyyət **Heydər Əliyevin** qadınlarla bağlı siyasi kursu davam edir. Hal –hazırda müvafiq İcra Hakimiyyətlərində müavin, universitetlərdə prorektor,nazirliklərdə müavin işləyən qadınlar var.Mədəniyyət,incəsənət, təhsil sahəsində böyük əksəriyyətlə rəhbər vəzifələrdə çalışaraq dövlətimizə xidmət göstərən qadınlarımızın sayı artmaqda davam edir. **Ulu öndərin** xüsusi diqqəti və səyi nəticəsində Ailə Uşaq Qadın Problemləri komitəsinin yaradılması 1995-ci ildə dünyanın aparıcı qadınlarının qatıldığı məşhur Pekin konfransında Azərbaycan qadınlarının iştirakı , Ali Məhkəmənin sədrinin qadın təyin edilməsi, Azərbyacanda ilk dəfə olaraq Ombudsman aparatının rəhbər vəzifəsinə Elmira Süleymanovanın təyin edilməsi bir daha onu göstərir ki, Azərbyacan qadınları ictimai-siyasi proseslərin, dövlət idarəçiliyində əsas iştirakçılarından birirdir. **Ulu öndər Heydər Əliyev** incəsənət nümayəndələrinə daima diqqətlə yanaşaraq ,yubileylərində iştirak etməklə yanaşı onları səmimi qəlbdən təbrik edərək daha böyük yaradıcılıq işləri görmələri üçün dəyərləndirir və ruhlandırırdı. Ümummilli liderimizin çoxşaxəli fəaliyyətinin nəticəsidir ki, Azərbaycan uğurlu inkişaf yolu ilə daha böyük uğurlara doğru inamla, ilhamla gedir.

Bu bir tarixi həqiqətdir ki, **Heydər Əliyev** bizim müstəqil, güclü, demokratik ölkəmizin fundamentini 1993-cü ildə od-alovun içərisindən çıxararaq qurmuşdur. Böyük dahinin ideya və düşüncələri ilə qurulan müstəqil Azərbaycanı bu gün onun siyasi kursunu bütün sahələrdə uğurla, ləyaqətlə , yüksək idarəçilik səriştəsi, beynəlxalq diplomatik təcrübə ilə dəyərli övladı cənab **Prezident**imiz İlham Əliyev və xanımı ölkəmizin Birinci vitse-**prezident**i, **Heydər Əliyev** Fondunun **prezident**i çox hörmətli Mehriban xanım Əliyeva tərəfindən müvəfəqiyyətlə davam etdirilir. Bu gün Azərbaycan xalqı tam əmindir ki, Azərbaycanın gələcəyi işıqlı və firavandır. Çünki müstəqil Azərbaycanın idarəçilik sükanı **Ulu öndər Heydər Əliyevin** siyasi kursunun layiqli davamçısı

Əliyevlər ocağının ən layiqli yetirməsi cənab İlham Əliyevin əlindədir. Biz Azərbaycan xalqı **Heydər Əliyev** ideyaları işığında müstəqil Azərbaycanımızın **Prezident**i İlham Əliyevlə daha yüksək zirvələr fəth ediləcəyini görürük və buna qəlbən inanırıq. Bu gün xalqımız ona görə xoşbəxtdir ki, məhz **Heydər Əliyevin** zəngin ideyalarının davamçısı olan layiqli siyasi varisi, Azərbaycan Respublikasının **prezident**i İlham Əliyevin rəhbərliyi altında gələcəyə addımlayırıq. Onun rəhbərliyi ilə ölkədə iqtisadi islahatlar daha da sürətləmiş, regionların sosial-iqtisadi inkişafına dair dövlət proqramları qəbul olunmuşdur. **Prezident** İlham Əliyev ölkədə insan haqları və azadlıqlarının daha dolğun təmin olunmasını daim diqqət mərkəzində saxlayır. O, **Heydər Əliyevin** Azərbaycan xalqının milli- mənəvi dəyərlərinin qorunub- saxlanılması və daha da inkişafı etdirilməsi kursunu uğurla həyata keçirir. **Ulu öndərin** qoyduğu siyasət ölkəmizin **Prezident**i cənab İlham Əliyevlə bərabər və Birinci vitse-**prezident** Mehriban xanım Əliyeva tərəfindən uğurla davam edir. Azərbaycanın birinci vitse-prezident xanım Mehriban Əliyeva özü sanki,bir mərhəmətlik rəmzidir. Hər bir sahəni diqqətində saxlayır. Nəinki, Bakı, Azərbaycanın hər bir guşəsi cənnətə çevrilmişdir. Təhsil, səhiyyə, idman sahəsində, milli dəyərlərimizin qorunması üçün böyük layihələr həyata keçirir. Ölkəmizin hər yerində səhiyyə ocaqları tikilir, təmir olunur, yeni müasir avadanlıqlar alınır, təhsil sistemində böyük uğurlu işlər aparılır. Ölkənin xoş gələcəyi,xalqın rifahı üçün böyük işlər görülür. Dövlətçiliyimizin qoşa qanadı və irəliyə doğru quruculuğumuzun etibarlı təminatçıları olan möhtərəm cənab **Prezident**imiz İlham Əliyev və Birinci vitse –**prezident** Mehriban Əliyeva ölkəmizi qətiyyətlə növbəti yüksəkliklərə aparır. Bütün Azərbaycan xalqının və tərəqqimizin qarantı olan bu birliyə, dövlətçiliyimizin sabahını etibarlı edən bu vəhdətə ürəkdən qoşulur və alqış deyirik.

**Zərifə Quliyeva: Ulu öndər Heydər Əliyev**
**YENİ AZƏRBAYCAN QURDU, TARİX YAZDI**
**Millixəbər.az saytı 02.10.2020**

**Dahi liderimiz xalqımızı müstəqilliyimizi itirmək təhlükəsindən xilas etdi.**

**Millxəbər. az** Zərifə Rzaqulu qızı Quliyeva ilə ictimai-siyasi əhəmiyyətli müsahibəni oxuculara təqdim edir:

**Zərifə xanım, müsahibə üçün Millixəbər.az redaksiyası adından minnətdarlığımızı bildiririk.**

Zamin müəllim, hər zaman olduqca vacib və əhəmiyyətli mövzularla bağlı mütəmadi olaraq,nəzər-diqqətdə saxlayaraq mənə müraciət edərək fikirlərimi öyrənirsiniz, bu cür diqqət və səmimiyyətinizə görə siz başda olmaqla Millixəbər.az saytının kollektivinə təşəkkür edirəm.

Bildirmək istərdim ki, siz Millixəbər.az saytı olaraq ölkəmizin ictimai-siyasi həyatında üzərinizə düşən işlərdə fəal iştirak edərək, peşəkar yazılarla çıxış edirsiniz,çalışqan və işgüzar fəaliyyətinizlə cəmiyyətə öz töhvənizi verməkdəsiniz, bu yöndə sizə uğurlar diləyirəm.

**- Bildiyiniz kimi Ulu öndər Heydər Əliyev 1993-cü ildə xalqın təkidi və tələbi,çoxsaylı ziyalıların müraciəti ilə Bakıya gəldi və Azərbaycana 2-ci dəfə Prezident seçilərək rəhbərlik etməyə başladı.Müstəqillik tariximizin olduqca çətin və şərəfli bu dövrünü yaxından görmüş ictimai-siyasi fəal, Azərbaycan qadını olaraq necə xatırlayırsınız?**

1993-cü ildə **Ulu öndər Heydər Əliyev** hakimiyyətə gələnə qədər Azərbaycan odun alovun içində yanırdı,quruplaşmalar var idi,qardaş qırğını ilə üzbəüz idi,oğruluq,cinayətkarlıq baş alıb gedirdi, hər tərəfdə hərcmərclik,xaos, anarxiya, pərakəndəlik hökm sürürdü. O zamanlar siyasi cəhətdən savadsız,idarəetmədə təcrübəsiz adamların hakimiyyətdə olması Azərbaycanı çox geri saldı.

1969-1992-ci ilə qədərki dövrdə və eyni zamanda **Heydər Əliyevin** Azərbaycana rəhbərlik etdiyi bütün dönəmlərdə böyük şəxsiyyət **Heydər Əliyevin** siyasi məktəbindən bəhrələnmiş milli və vətənpərvər ruhlu kadrların olması və yenidən dahi liderimizin ətrafında birləşməsi xalqımızı müstəqilliyimizi itirmək təhlükəsindən xilas etdi "**xalq Heydər, Heydər xalq**" birliyi bərpa olundu,dövlətçiliyimizin əsasları

qoyuldu.

Nəzərə yetirək ki, 1987-ci ildə Azərbaycanın başının üstünü qara buludlar almağa başladı, bu dövrdə ermənilər öz şovinist niyyətlərini həyata keçirmək üçün təxribatlar törədirdilər.Belə bir çətin dövrdə yaşayırdıq.1987-ci ildə **Ulu öndər Heydər Əliyev** öz ərizəsi ilə işdən uzaqlaşdırıldıqdan sonra onun ideya və siyasi xəttinə sadiq qalan təcrübəli kadrları işdən kənarlaşdırırdılar.Xatirinizdədirsə, qeyd etmişəm ki, hətta, o dövrdə məni **Heydər Əliyevin** kadrı olduğuma görə işdən uzaqlaşdırdılar.Ancaq bundan qürur duyurdum və buna görə heç narahat da olmadım,ona görə ki, belə bir milli və vətənpərvər şəxsiyyətin kadrı olmaqdan çox məmnun idim.

O dövrdə mənfur qüvvələrin əsas məqsədi **Ulu öndər**i hakimiyyətdən,siyasətdən uzaqlaşdırmaq idi. Çox təəssüflə qeyd etmək istərdim ki, mənfur ermənilərlə içimizdə yaşayan erməni mənşəli, ermənipərəst azərbaycanlılar bir-birləri ilə sıx əlaqədə idilər.

Bu bir həqiqətdir ki, **Heydər Əliyev** 1969-cu ildə hakimiyyətə gəldikdən sonra bütün sahələrlə yaxından tanış olurdu, insanlarımızın həyat şəraitinə, güzaranına xüsusi diqqətlə yanaşırdı. O dövrdə işsizlik minumum həddə çatdırılmışdı, yoxsulluq xeyli azalmışdır.Yoxsulla varlı arasında sosial hüquqi bəbərlik mövcud idi. O xalqını çox sevirdi, millətin arasında idi.

Yaxşı yadımdadır ki, 1992-1993-cü illərdə hakimiyyət başında olan quruplaşma halında fəaliyyət göstərən səriştəsizlər dələduzluq əməllərinə belə əl atırdılar.Hətta bir-birlərini təhqir etməklə yanaşı yollarını kəsirdilər. Biz 50-60 nəfərdən ibarət bir kollektivdə çalışırdıq. Əli avtomatlılar çalışdığımız tibbi müəssisəyə daxil olaraq karobkanı atdılar qarşımıza dedilər ki, əlinizdə qolunuzda nə qədər qızıl,zinət əşyaları var atın bura orduya kömək məqsədi ilə edirik. Sizcə belə bir iyrənc hərəkətlərə yol verənlərin orduya köməkliyimi olardı?Məcburiyyət qarşısında qalaraq, qadınların daha çoxluq təşkil etdiyi kollektiv olaraq qorxumuzdan üstümüzdəki bütün qızıl əşyalarını atdıq onların karobkalarına…

O zaman Azərbaycana rəhbərlik edənlər harada idilər, nə işlə məşğul idilər? Biz neçə kilometrlərlə yolu Nizami rayonundan qət edərək Şəhidlər Xiyabanına gəlib 20 Yanvar şəhidlərini dərin hüzünlə dəfn edəndə ortalığa çıxa bilmirdilər, sonradan Şeyx Allahşükür Paşazadə gəldi.Çünki üzləri yox idi xalqın qarşısına çıxmağa…



Fəxrlə demək lazımdır ki, **Heydər Əliyev** səhhətindəki narahatlığına baxmayaraq,vətəninə,xalqına sevgisinə rəğmən 1990-cı il yanvarda Moskvada Azərbaycan nümayəndəliyinə gələrək cəsarətli, tarixi əhəmiyyətli mətbuat konfransı keçirdi,azərbaycanlıların yanında olmağını bəyan etdi,baş verən hadisələrdən narahatlığını ifadə etdi. Ancaq burada yarıtmaz rəhbərlikdə olanlar televiziya qarşısına belə çıxmadılar.

Bu illərdə Azərbaycanda quruplaşma şəraitində rəhbərliyi həyata keçirənlər, ölkəmizi çətin bir duruma salmışdılar, siyasi gərginlik tüğyan edirdi.İnsanların hüquqları pozulurdu,iqtisadiyyat çökməyə başladı. İnsanlar evlərinə rahat gedib-gələ bilmirdilər.Xalqımızın düşdüyü belə bir çətin və dözülməz şəraitdən yalnız uzaqgörən, dahi lider **Heydər Əliyev** çıxara bilərdi.Öz liderini sevən, qəbul edən,dəstəkləyən ləyaqətli vətəndaşlarımız özünün layiqli **prezident**ini seçdi.

O zaman Azərbaycana rəhbərlik edən Əbülfəz Elçibəy başda olmaqla iqtidarda olanlar özləri **Heydər Əliyev**i Bakıya dəvət edirdilər ki, gəlib xalqı bu ağır bəladan qurtarsın.Əbülfəz Elçibəy açıq-aydın görürdükü ətrafındakı məmurlar səriştəsiz fəaliyyətlə xalqa xəyanət edirlər.Xalqın təcrübəli dövlət rəhbərinə ehtiyyacı var.Xalq öz

qurtuluşunu **Heydər Əliyev**lə tapdı.

Xalq ona üz tutanda **Heydər Əliyev** Naxçıvanda çalışırdı. O Azərbaycanın üç rəngli bayrağını Naxçıvanda zirvələrə qaldırdı, qarlı,şaxtalı çətin bir şəraitdə Yeni Azərbaycan Partiyasının nizamnaməsini yazıb-yaratdı.

Çoxsaylı müraciətlərdən sonra xalqın səsinə-səs verərək **Heydər Əliyev** Bakıya gəlməyə razılıq verdi və Yeni Azərbaycan qurmaq arzusunu reallaşdırmağa başladı. Bakıya gələn kimi ilk cəsarətli səfərini qədim Gəncə şəhərinə etdi. Gəncə şəhərində qarşıdurma pik həddə idi. Surət Hüseynov hökmranlıq edirdi. Gəncə şəhərində olduğu 9 gün ərzində vəziyyəti nizamladı,qarşıdurmanı, qardaş qırğınının qarşısını aldı. Hətta o dövrdə bəzi səriştəsiz deputatlar, şəxsi maraqlarını güdənlər Ona Milli məclisdə çıxış etməyə imkan vermirdilər.

Fərəhlə qeyd etmək istərdim ki, O müstəqil və müasir Azərbaycanın memarı olaraq hakimiyyətdə olduğu 10 il ərzində bir əlində xətkeş bir əlində qələm Azərbaycanı dünyaya tanıtdırdı.Dünyanın diqqətini Azərbaycana yönəltməyə müvəffəq oldu. Azərbaycan adlı məmləkətdə xalq olaraq azərbaycanlıların mövcudluğunu, yaşayıb-yaratmalarını dünya ictimaiətinə çatdırdı. Bir sözlə, **Heydər Əliyev** yeni Azərbaycanı qurdu,tarix yazdı. Onun uzaqgörənliyi ilə Müstəqil və Azərbaycan özülü möhkəm təməllər üzərində quruldu.Azərbaycan və Ermənistan arasında atəşkəs əldə olundu. Onun Beynəlxalq aləmdə olan şəxsi nüfuzu sayəsində, Beynəlxalq aparıcı investorlar, iş adamları Azərbaycana gələrək sərmayə qoymağa başladılar. Az keçmədi ki,ayrı-ayrı dövlət rəhbərlərinin iştirakı ilə Azərbaycan tarixində önəmli yer tutan **Əsrin müqaviləsi** imzalandı. Bununla da, Azərbaycanın iqtisadi-siyasi inkişaf dövrü başladı. Azərbaycan xalqının taleyində "**Əsrin kontraktı**" özünəməxsusluğu ilə seçilir.

Bu gün hər birimiz öz fəaliyyətimizlə ümummilli liderimiz **Heydər Əliyevin** bizə miras qoyub getdiyi, bu günkü möhtəşəm inkişaf yolunu görmək istədiyini yüksək idarəçilik əzimkar faəliyyətlə reallaşdıran onun layiqli davamçısı **Prezident** İlham Əliyev və xanımı **Heydər Əliyev** Fondunun **prezident**i, Birinci vitse-**prezident Mehriban Əliyevanın** ətrafında birləşərək gündən-günə çiçəklənən, qüdrətlənən,müasirləşən Azərbaycanı göz-bəbəyimiz kimi qorumalıyıq.

Istənilən dövr baş verən hadisələrə nəzər yetirdikdə aydın görürsən ki, dövləmizin inkişafına əngəl olan, milli maraqlara

xidmət etməyənlər,düşmən dəyirmanına su tökən xainlər o dövrdə də olub, indi də var. Düşünürəm ki, bu cür xainlərdən qurtulmağın zamanıdır.Qanunu pozanlar, rəhbərliyin tapşırığına laqeydliklə yanaşanlar cəzalandırılmalı və hər kəs öz yerini bilməlidir.Hər kəs qanun qarşısında bərabərdir.Azərbaycanımızı qoruyub saxlamaq hər birimizin borcudur.Vəzifəmizdən, peşəmizdən asılı olmayaraq **Ulu öndərin** siyasi kursunun layiqli davamçısı **Prezident** İlham Əliyevə arxa-dayaq olaraq dövlətimizi daha da inkişaf etdirməliyik.

Beləki, xalqımızın təkidi və tələbi ilə Ümummilli liderimiz **Heydər Əliyev** 2-ci dəfə hakimiyyətə gələrək xalqımızı odun-alovun içərisindən çıxardı, qədirbilən, ləyaqətli xalqımız öz doğru seçimini edərək, yenidən öz ləyaqətli liderinə arxa-dayaq oldu, lideri də əziz və dəyərli xalqına arxa oldu…

**Heydər Əliyev** vətəndaş müharibəsinin qarşısını aldıqdan sonra iqtisadiyyatı dirçəltdi, güclü ordu quruculuğuna başladı, 1995-ci ildə 12 noyabrda ilk konstitusiya qəbul olundu.Bu gün fərəh hissi ilə demək olar ki, **Heydər Əliyevin** müəyyənləşdirdiyi strateji siyasi xətt möhtərəm **Prezident** İlham Əliyev tərəfindən uğurla davam etdirilir.Birinci vitse-**prezident** Mehriban xanım Əliyeva öz ana tövsiyyələri,uğurlu işləri ilə dövlətimizin inkişafına töhvə verərək,xalqımızı irəliyə doğru aparır. Mehriban xanımın təşəbbüsü ilə **Heydər Əliyevin** vəfatının birinci ildönümündə **Heydər Əliyev** Fondu yarandı. Bu fond **Heydər Əliyev** irsinin təbliği ilə yanaşı xexirxahlıq missiyası, insanlara qayğı,kimsəsizlərə dayaq,xəstələrə maddi və mənəvi dəstək kimi insanların taleyində önəmli rol oynayır.**Heydər Əliyev** Fondunun çoxşaxəli fəaliyyəti o qədər zəngindir ki, bir müsahibə ilə onu əhatə etmək mümkün deyil.

**-Son zamanlar milli və vətənpərvər Azərbaycan vətəndaşlarını narahat edən əsas məsələlərdən biri də milli maraqlara xidmət etməyən antimilli ünsürlərin cənab Prezident İlham Əliyevin uğurlu islahatlar kursuna əngəl olmaq istəyənlərə qarşı görülən işlər sizi qane edirmi?**

Təəssüfki, milli maraqlara xidmət etməyən antimilli ünsürlər var, buna qarşı dövlət başçısı və aidiyyəti üzrə güc strukturları tərəfindən uğurlu işlər aparılır.Azərbaycanın dövlət Başçısı İlham Əliyev və xanımı Birinci vitse-**Prezident** Mehriban xanım Əliyeva tərəfindən ölkəmizin daxili və xarici siyasət xəttinə xüsusi fikir verilir.Bu cür

peşəkar siyasətin nəticəsidirki, Beynəlxalq diplomatiyada uğurlarımız artmaqdadır.

Beynəlxalq siyasətdən danışarkən Yeni Azərbaycan Partiyasının fəaliyyətinə diqqət çəkmək istərdim.

**Ulu öndər Heydər Əliyevin** çətin dövr və şəraitdə yaratdığı YAP-da mütləq kadr dəyişikliyi, yenilənmə, təmizlənmə işlərinin aparılması da zamanın tələbidir.

Partiya daxilində şəxsi maraqlara xidmət edənlər, çirkin niyyəti olanların partiya sıralarında mövcudluğuna imkan verilməməlidir. Dövlətçiliyə, milli maraqlara xidmət edən vətənpərvər vətəndaşlarımızın partiyadan irəli çəkilməsi olduqca vacibdir. Partiya idarəediciləri daxili və xarici siyasətin təbliğində bütün üzvlərə bərabər şərait yaratmalıdır.Hər bir YAP üzvünə tribuna verilməlidir. YAP iqtidar partiyası olaraq daha çox nümunəvi mövqe ortaya qoymalıdır. Əminəm ki, çox yaxın gələcəkdə YAP-ın sədri hörmətli **Prezident**imiz İlham Əliyev tərəfindən YAP-da uğurlu kadr islahatlarına göstəriş və qərar verilərək icrası uğurla təmin ediləcəkdir.

Bu gün faktiki müharibə şəraitində olan ölkəmiz öz torpaqlarını azad etmək ruhundadır.Dövlət başçısı, **Ali Baş Komandan**ımız, **Prezident** İlham Əliyev və **Birinci vitse-prezident** Mehriban xanım Əliyeva ön cəbhəni daima diqqətdə saxlayırlar.Artıq ordumuz təmas xəttində öz üstünlüklərini gündən-günə möhkəmləndirir,düşmənə sarsıdıcı zərbələr endirirlər. Dövlət başçısının mövqeyi hər kəsə bəllidir. Qarabağ Azərbaycandır! Azərbaycan torpaqları geri qaytarılmalı,düşmənin işğalçılıq siyasətinə son qoyulmalıdır. Bu arada hər bir Azərbaycan vətəndaşı **Ali Baş Komandan**ın tapşırıq və tövsiyyələrinə əməl etməli,onun ətrafında sıx-sıx birləşməli Qarabağımızı birlikdə azad etməkdə öz vətənpərvərlik borcunu yerinə yetirməlidir.



**Ulu öndər siyasi uzaqgörənliyinin zirvəsi - dövlətimizin inkişafını təmin edəcək XX əsrin Lideri - İlham Əliyev**

*Sia.az. sayti, 11.06.2020*
**Səs* qəzeti*

Bəli, bugün Azərbaycanda siyasi hakimiyyətin **Heydər Əliyevin** yaratdığı dövlətçilik təməli üzərində inkişaf etdirilməsi, möhkəmləndirilməsi zərurəti üzərində düşünərkən təsdiqini tapmış belə bir həqiqəti dərk edirik ki, **Heydər Əliyevin** siyasi uzaqgörənliyinin zirvəsi onun özündən sonra siyasi kursunu hamıdan yaxşı davam etdirərək, Azərbaycanın müstəqilliyini hamıdan yaxşı qoruya biləcək, dövlətimizin inkişafını hamıdan yaxşı təmin edəcək yeni dövrün Liderini - İLHAM ƏLİYEVİ yetişdirməsi olmuşdur.

Azərbaycanı Qafqazın dövlətinə çevirmiş, ölkəsinin bütün sahələrdə qalibiyyət potensialını üzə çıxarmış **Prezident** İlham Əliyevlə Azərbaycan xalqı özünə ən etibarlı siyasi gələcək, mütərəqqi inkişaf yolunu seçdiyini təsdiqləyir.

**Prezident** İlham Əliyevin rəhbərliyi ilə Azərbaycanın istər daxili, istərsə də xarici siyasətində əldə edilən hər bir uğur **Ulu öndər Heydər Əliyevin** zəkasının təcəssümü, onun irsən qoyub getdiyi milli

tərəqqi ideyalarının təzahürüdür. Respublikada müstəqillik dövründə demokratikləşmə prosesləri genişlənmiş, ölkəmizin dünyaya transformasiya proseslərinə inteqrasiyası daha intensiv xarakter kəsb etmiş, milli iqtisadiyyatın daha da inkişafı üçün mühüm sosial-siyasi baza yaranmışdır. **Ulu öndər Heydər Əliyevin** siyasət məktəbinin layiqli yetirməsi olan İlham Əliyevin böyük siyasətdə atdığı inamlı addımlar sayəsində Azərbaycanda təkcə sosial-iqtisadi sistemdə deyil, həm də siyasi və ictimai təsisatlarda əsaslı yeniləşmələr olmuş, səmərəli intensiv islahatlar aparılmışdır.

**Prezident** İlham Əliyev vurğulayıb: «Bizim təcrübəmiz onu göstərir ki, Azərbaycanın seçdiyi yol düzgün yoldur. İqtisadi, siyasi və sosial islahatların paralel şəkildə aparılması Azərbaycanı hərtərəfli inkişaf etdirir, ölkəmiz üçün çox lazım olan sabitliyi möhkəmləndirir, ictimai-siyasi vəziyyətə müsbət təsir göstərir».

**Dövlətləri və millətləri birləşdirən uğurlu siyasət-** bu, Azərbaycan **Prezidenti** İlham Əliyev siyasətidir. Dünyanı çalxalayan koronavirus pandemiyası zamanında Qoşulmama Hərəkatının Sədri kimi **Prezident** İlham Əliyevin təşəbbüsü ilə Qoşulmama Hərəkatının Təmas Qrupu formatında videokonfrans vasitəsilə Zirvə görüşününün keçirilməsi ilk növbədə dövlət başçısının dünyada böyük nüfuza malik lider olmasının göstəricisidir. Qoşulmama Hərəkatının Bakıda keçirilən XVIII Zirvə görüşündə təşkilata sədrliyi öz üzərinə götürən zaman **Prezident** İlham Əliyev bəyan etdi ki, Azərbaycan beynəlxalq arenada üzv ölkələrin maraqlarının müdafiə edilməsi üçün əməli addımlar atacaq, həmrəyliyin gücləndirilməsini və qarşılıqlı dəstəyi rəhbər tutacaq.

Qeyd edək ki, bu Zirvə görüşü də bir daha göstərdi ki, Azərbaycan **Prezident**inin sözü ilə əməli birdir. Zirvə görüşündə ölkə başçısı Azərbaycanın koronavirusla mübarizə modelini dünyaya təqdim edərkən faciənin qarşısının alınması üçün həmçinin, dünyaya yol göstərdi. Bu gün bütün sahələrdə olduğu kimi, koronavirusla mübarizə tədbirlərində də ölkəmiz dünyada özünəməxsus imic formalaşdırdı - Azərbaycan modeli. Bu reallıqdır. Çünki Azərbaycanın unikal təcrübəsi dünya tərəfindən qəbul edilib, bəyənilib. Həmçinin, reallaşdırılan sosial-iqtisadi dəstək proqramları, genişmiqyaslı antiböhran tədbirlər də beynəlxalq qurumlar tərəfindən yüksək qiymətləndirilir. Çünki Azərbaycan artıq beynəlxalq aləmdə inkişaf,

tərəqqi, yüksəliş simvoluna çevrilir. Və bütün dünyanın etiraf etdiyi bu reallıq **Prezident** İlham Əliyevin fəaliyyətinə verilən haqlı və real qiymətdir. Və Azərbaycan dünya üçün qlobal düşüncəni təqdim etdi. Bu, həmçinin dövlətləri və millətləri birləşdirən siyasət oldu. Bu siyasət Azərbaycan tərəfindən təqdim olundu. Azərbaycanın gördüyü işlər təkcə bu gün yox, gələcəkdə də öyrəniləcək. Əlbəttə ki, bu bir fəxrdir, qürurdur!

Bəli, bütün bunların əsas mənbəyi isə məhz 15 iyun tarixindən doğan reallıqlardır. Və biz bir daha əminliklə deyə bilərik ki, əldə edlən inkişaf və tərəqqi müstəqil Azərbaycan uğrunda və **Heydər Əliyevin** ölməz ruhu qarşısında fədakarlıqla çalışmağın nəticəsidir.

**Ulu öndər Heydər Əliyevin** özü vaxtilə müdrikcəsinə demişdir: **«Heç bir qüvvə Azərbaycanın müstəqilliyini əlindən ala bilməz. Bundan sonra heç bir qüvvə Azərbaycan dövlətçiliyini məhv edə bilməz»**.

Bu inam, bu qətiyyət Milli Qurtuluş gününün mənası və verdiyi ibrət dərsləridir. Bu onu göstərir ki, nə qədər Azərbaycan var, **Heydər Əliyev** də olacaq, onun ideya və əməlləri yaşayacaq, bizi daim doğru yolla, irəliyə aparacaqdır. **Prezident İlham Əliyev vurğulayır: «Ona zaman da qalib gələ bilmədi» və əlavə edir:** «...**Heydər Əliyev** qalib idi. O, bütün döyüşlərdən qalib kimi çıxıb, heç kim ona qalib gələ bilməmişdir. Əslində, o, yeni güclə, yeni enerji ilə siyasi mübarizəyə qoşuldu, yenidən qələbə qazandı və tarixdə qalib kimi qaldı. Heç kim və heç nə ona qalib gələ bilmədi. Nə xarici düşmənlər, nə də Azərbaycanda özünü ona rəqib qismində təqdim etməyə çalışanlar, bəzi uğursuz siyasətçilər. Ona zaman da qalib gələ bilmədi!»

Azərbaycan **Prezident**i İlham Əliyevin söylədiyi bu fikirlər zaman keçdikcə öz əhəmiyyətini saxlamaqdadır və saxlayacaqdır. Məhz bunun nəticəsidir ki, XXl əsrin Azərbaycanı dünyanın döyünən ürəyinə, mərkəzinə çevrilən bir ölkə kimi beynəlxalq aləmdə də öz qətiyyətli sözünü deməkdədir. Çünki Ümummilli Lider **Heydər Əliyev** ideyaları sarsılmaz, dönməzdir və bu ideyalaları başda dövlət başçımız İlham Əliyev olmaqla, bütün xalqımız yaşadır. Bizlər də bu faktoru əsas götürərək Azərbaycanımızın çiçəklənməsi naminə **Ulu öndər Heydər Əliyev** ideyalarının layiqli davamçısı **Prezident** İlham Əliyevin ətrafında daha da sıx birləşəcəyik.



**Zərifə Quliyeva: "YAP Azərbaycanı zirvələrə aparan yolun mayakıdır" MÜNASİBƏT**

*05.03.2022, Səs qəzeti*

"Yeni Azərbaycan Partiyasının VII qurultayında qeyd olunduğu kimi, YAP novatorluq siyasəti ilə öz işini uğurla davam etdirir, partiya üzvləri ölkə qarşısında dayanan mühüm problemlərin həllinə məsuliyyətli vətəndaşlıq hissi ilə yanaşırlar". Bu fikirləri SİA-ya "Modern ailə və inkişaf" İctimai Birliyinin sədri Zərifə Quliyeva bildirib.

Mart ayının 5-də Yeni Azərbaycan Partiyasının (YAP) VII qurultayının keçirilməsi həm də zərurətdən irəli gələn reallıq idi: "Möhtərəm **Prezident**imiz, partiyamızın Sədri İlham Əliyevin vurğuladığı kimi, regionda yaranan reallıqlar, mühüm layihələr bölgəyə yeniliklər gətirməklə əməkdaşlığın yeni formatlarını şərtləndirdi və eyni zamanda, Azərbaycanın müəllifi olduğu qlobal diplomatiya gerçəkliyi yeni çağırışlara yol açdı".

"**Prezident**, İlham Əliyev respublikamızın son 17 illik inkişaf tarixinə nəzər salaraq ölkəmizin dayanıqlı siyasi, iqtisadi inkişafında iqtidar partiyasının qarşıya qoyduğu hədəflərinə nail olduğunu da xüsusilə qeyd edib". Məhz aparılan ardıcıl, əməli işlər sayəsində beynəlxalq aləmdə Azərbaycan çox böyük nüfuza və hörmətə

malik olan ölkəyə çevrilib: "44 günlük Vətən müharibəsində ərazi bütövlüyümüzün bərpası isə xalq-iqtidar birliyinin təntənəsi olaraq qiymətləndirilir".

"Biz bu yerdə **Ulu öndər Heydər Əliyevin** xalqımıza miras qoyduğu müstəqil Azərbaycanın inkişafı və tərəqqisi barədə də çoxsaylı faktlarımızı önə sürə bilərik". Əbəs deyil ki, partiyanın yaranmasının Ümummilli Lider **Heydər Əliyevin** adı ilə bağlı olduğunu vurğulayan **Prezident** İlham Əliyev daim onu da qeyd edir ki, ölkədə demokratiyanın inkişafı, dövlətçiliyin təkmilləşdirilməsi, hüquqi bazanın möhkəmləndirilməsi, vətəndaş həmrəylinin möhkəmləndirilməsi məhz onun – **Ulu öndər Heydər Əliyevin** Azərbaycan xalqına göstərdiyi misilsiz, tarixi xidmətlərinin bəhrələridir: "**Ulu öndər Heydər Əliyev**ə üz tutaraq ölkəni parçalanmaqdan qurtarmağını xahiş edən ziyalıların fədakarlığını YAP-ın VII qurultayındakı çıxışında xatırladaraq, yüksək qiymətləndirən **Prezident** İlham Əliyev "Mən bu gün bir daha o vaxt bu milli maraqları hər şeydən üstün tutan "91-lər"i qeyd etmək istəyirəm, onların fəaliyyətini yüksək qiymətləndirirəm. Bu gün də onların bir çoxu bizim sıramızdadır. Bundan sonra da onlar fəal işlərlə məşğul olacaqlar, Yeni Azərbaycan Partiyasının Veteranlar Şurasında fəaliyyət göstərəcəklər və ictimai həyatda fəaliyyət göstərəcəklər" sözlərinə əlavə olaraq vurğulamışdı ki, onları Azərbaycan xalqı unutmamalıdır. O, bir **Prezident** kimi hər zaman veteran YAP-çıların fəaliyyətini yüksək qiymətləndirdiyini qeyd edib. Yalnız ona görə yox ki, həmin insanlar **Heydər Əliyev**ə müraciət ediblər, ona görə ki, həyatlarının təhlükədə olmasından qorxmadılar, çəkinmədilər, ölkə maraqlarını öz şəxsi maraqlarından üstün tutdular".

"Azərbəycan xalqı **Ulu öndər Heydər Əliyev** siyasi ideologiyasını uğurla davam etdirən **Prezident**, YAP Sədri İlham Əliyevin ətrafında sıx birləşməklə öz sarsılmaz həmrəylinini nümayiş etdirir. Azərbaycanın siyasi, iqtisadi inkişafının davamlılığı, respublikada ictimai-siyasi sabitliyin təmin olunması, ölkəmizin müdafiə qüdrətinin möhkəmlənməsi, o cümlədən, gender bərabərliyinin inkişafı, uğurlu qadınlar siyasəti YAP-ın əsas hədəflərindəndir: "YAP, Azərbaycanı zirvələrə aparan yolun mayakıdır. Belə ki, Azərbaycanda keçirilən bütün siyasi kampaniyalarda qələbə qazanaraq xalqın etimadını doğruldan partiyanın sıralarının genişlənməsi bu partiyaya ümumxalq məhəbbətindən, **Prezident**, YAP-ın Sədri İlham Əliyevə əbədi etimaddan irəli gəlir".

## Hər bir uğurumuz Heydər Əliyev siyasətinin təntənəsidir

*22.05.2023*

**Azərbaycan xalqı ümummilli liderimiz Heydər Əliyevi hər zaman böyük ehtiramla yad edir, Ulu öndərin əziz xatirəsini daim uca tutur. 20 ildir ki, cismən aramızda olmasa da, Ulu öndərimizin müəyyənləşdirdiyi siyasət daim ölkəmizə və xalqımıza işıqlı yol göstərir.**

**Prezident** İlham Əliyevin 29 sentyabr 2022-ci il tarixində "Azərbaycan Respublikasında 2023-cü ilin "**Heydər Əliyev** İli" elan edilməsi haqqında" imzaladığı Sərəncamda deyilir: «**Heydər Əliyev** öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz **Heydər Əliyev** zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan **Heydər Əliyevin** həyat amalının təntənəsidir».

Qalib Liderimiz, **Prezident** İlham Əliyev mayın 10-da Zəfərimizin tacı olan Şuşadan Azərbaycan xalqına müraciətində deyib ki: Ümummilli lider **Heydər Əliyev** bütün dövrlərdə doğma xalqına sədaqətlə xidmət etmişdir: "Ümummilli liderin sovet Azərbaycanı dövründə - 1969-82-ci illərdə Azərbaycanı ən geridə qalmış yerlərdən ən qabaqcıl yerlərə gətirmişdi".

«Müstəqil Azərbaycanın sənaye və iqtisadi potensialı məhz o illərdə formalaşmışdır. Məhz o illərdə yetişmiş kadrlar müstəqil Azərbaycanda və bu gün də fəaliyyət göstərərək bizim ümumi inkişafımızı təmin edirlər».

Azərbaycan xalqının faciələrinin **Heydər Əliyevin** siyasi hakimiyyətdən getməsindən sonra başladığını deyən **Prezident** İlham Əliyev Azərbaycan xalqına müraciətində vurğulamışdır ki: "**Heydər Əliyev** 1982-87-ci illərdə Sovet İttifaqı Kommunist Partiyasının Siyasi Bürosunun üzvü və Sovet Hökuməti sədrinin birinci müavini kimi daim Azərbaycana öz diqqətini, qayğısını göstərirdi. Məhz bu qayğı və diqqət nəticəsində Azərbaycan o illərdə də uğurla inkişaf edirdi".

Azərbaycan xalqının faciələrinin **Heydər Əliyevin** siyasi hakimiyyətdən getməsindən sonra başladığını diqqətə çatdıran dövlətimizin

başçısı qeyd edib: "1987-ci ildə istefa verməsindən iki həftə keçməmiş erməni millətçiləri və onların sovet iqtidarında olan himayədarları ovaxtkı Dağlıq Qarabağ Muxtar Vilayətinin Azərbaycanın tərkibindən çıxarıb Ermənistanın tərkibinə verilməsi ilə bağlı məsələ qaldırmışdılar və Azərbaycan xalqının faciələri o gündən başlamışdır. Şübhə yoxdur ki, əgər **Heydər Əliyev** hakimiyyətdə təmsil olunsaydı, heç vaxt erməni millətçiləri bu çirkin əməllərə əl atmağa cürət etməzdilər".

«**Heydər Əliyevin** gücü, müdrikliyi, ümumiyyətlə, **Heydər Əliyev** amili Azərbaycanı bir çətir kimi qoruyurdu»

**Prezident** İlham Əliyev Azərbaycan xalqına müraciətində **Ulu öndər Heydər Əliyevin** siyasi fəaliyyətdən kənarda qaldığı illərdə də hər zaman Azərbaycanın maraqları ilə yaşadığını, ürəyinin Azərbaycanla bir döyündüyünü vurğulayan dövlətimizin başçısı bildirib: «**Heydər Əliyev** xalqımız üçün ağır günlərdə - 20 Yanvar faciəsindən sonra yenə də xalqımızın haqq səsini dünyaya məhz o çatdırmışdır. Yanvarın 21-də Azərbaycanın Moskvadakı daimi nümayəndəliyinə gələrək öz haqq səsini ucaltmış, sovet hökumətinin, Sovet İttifaqının rəhbərliyinin bu qanlı əməlini pisləmiş və bu qırğınla bağlı dünyaya bəyanat vermişdir. Mən onun yanında idim, o günü yaxşı xatırlayıram, həm faciəvi gün idi, eyni zamanda, qürurverici bir gün idi. Moskvada yaşayan azərbaycanlılar daimi nümayəndəliyin önünə toplaşmışdılar və **Heydər Əliyev** binaya yaxınlaşanda sanki bir canlı dəhliz açılmışdı. Baxmayaraq ki, o, bütün vəzifələrdən çıxarılmışdır, ona qarşı Azərbaycanda ovaxtkı rəhbərlik tərəfindən çirkin kampaniya aparılırdı, sovet mətbuatında da çirkin kampaniya aparılırdı, ancaq Azərbaycan xalqının qəlbində o, daim böyük lider kimi yaşayırdı».

Bəli, dövlət başçımızın ümummilli lider **Heydər Əliyevin** 100 illik yubileyi münasibətilə Azərbaycan xalqına müraciətində söylədiyi kimi, **Heydər Əliyev**ə göstərilən inam Azərbaycan xalqının müdrikliyini bir daha nümayiş etdirdi. **Heydər Əliyevin** 1993-cü ilin oktyabrında böyük səs çoxluğu ilə Azərbaycan Respublikasının **Prezident**i seçildiyini xatırladan dövlətimizin başçısı bildirib: «Bundan sonra dərhal ciddi islahatlara başlanıldı, siyasi sahədə islahatlar aparıldı, bütün azadlıqlar təmin edildi. AXC-Müsavat cütlüyü tərəfindən tətbiq edilmiş antidemokratik senzura qaydaları ləğv edildi. Azərbaycan dünyaya açıldı, Azərbaycan xalqı **Heydər Əliyevin** simasında güclü Lider seçdi və yanılmadı». Və bu gün Azərbaycan ...

## BUGÜNKÜ AZƏRBAYCAN HEYDƏR ƏLİYEVİN GÖRMƏK İSTƏDİYİ AZƏRBAYCANDIR

Çünki bugünkü Azərbaycan **Heydər Əliyevin** görmək istədiyi Azərbaycandır və **Ulu öndərin** qoyduğu yolla uğurla gedir, inkişaf edir. Və **Ulu öndər** tərəfindən müəyyənləşdirilən siyasi kurs və **Prezident** İlham Əliyevin bu siyasi kursu uğurla davam etdirməsi faktı dayanır. Bu günün fövqündən baxanda Azərbaycanın gələcəyi daha işıqlı və firavan görünür. Dahi şəxsiyyətin bu günümüz və gələcəyimiz üçün səsləndirdiyi fikirlərə, tezislərə diqqət yetirdikdə onun torpaq, Vətən sevgisinin nə qədər böyük olduğunu görürük. **Ulu öndərin** suverenliyimizi daimi yaşatmaq, dövlət müstəqilliyimizi əbədi etmək üçün harada yaşamasından asılı olmayaraq hər bir azərbaycanlıya müqəddəs Azərbaycan qayəsi ətrafında əməl və əqidə birliyinə, sarsılmaz həmrəyliyə çağırışlar etməsi də bu sevgisindən qaynaqlanırdı. Ümummilli liderin elə bir xarici ölkəyə səfəri yox idi ki, bu gün artıq tarixə qovuşan "Dağlıq Qarabağ" münqişəsindən bəhs olunmasın, erməni yalanları faktlar əsasında dünya ictimaiyyətinə çatdırılmasın. Böyük Öndər **Heydər Əliyev** demişdir: «**İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə ümidlər bəsləyirəm**».

Bu gün **Ali Baş Komandan**, **Prezident** İlham Əliyevin «dəmir yumruq» siyasəti nəticəsində Güclü Ordumuzun rəşadətli əsgər və zabitlərimizin qəhrəmalığı ilə 30 illik torpaq həsrətinə 44 günlük İkinci Vətən müharibəsi mümkünsüzü mümkün etdi, düşməni diz çökdürdü. Azərbaycan **Prezident**i İlham Əliyevin söylədiyi kimi: **«Dərsini verdik. Öz bayrağımızı ucaltdıq Şuşada və bütün başqa şəhər və rayonlarımızda. Hər kəs gücümüzü gördü. Hər kəs qüdrətimizi gördü, iradəmizi gördü. Bu dəmir yumruq onların belini qırdı, onların başını əzdi. Bu, birlik yumruğudur, bu, güc yumruğudur. Bundan sonra Azərbaycan yalnız inkişaf, tərəqqi yolu ilə gedəcək. Bundan sonra da biz ordu quruculuğu işində əməli addımlar atacağıq, ordumuzu daha da gücləndirəcəyik. Bütün göstərişlər verildi. İradəmiz də var, təcrübəmiz də var - əvəzolunmaz təcrübə. İndi bütün ölkələr bu Vətən müharibəsinin təcrübəsini öyrənirlər. Vəsaitimiz də var. Xalq-**

**iqtidar birliyimiz də var. Biz göstərmişik ki, böyük xalqıq, qürurlu xalqıq. Düşməni yerə vurduq. Düşmənin belini qırdıq, məhv etdik. Bu, tarixi Qələbədir. Bu Qələbə Azərbaycan tarixində əbədi qalacaq, şanlı Qələbə kimi!».**

Bəli, ruhun şad olsun **Ulu öndər**, Qarabağ Azərbaycandır! **"Vaxtilə söylədiyin Şuşasız Qarabağ, Qarabağsız ümumiyyətlə Azərbaycan yoxdur" kəlamın reallaşıb. Azərbaycan xalqının Qalib Lideri, Azərbaycan xalqının Prezidenti İlham Əliyev «Dəmir siyasət»inin nəticəsində «Dağlıq Qarabağ» problemi yoxdur!. Prezident İlham Əliyev bildirib ki, biz döyüş meydanında, siyasi müstəvidə Qələbə qazanmışıq və bu Qələbə ölkəmiz üçün yeni dövr açır. Bu dövr inkişaf, təhlükəsizlik, tərəqqi dövrü olacaqdır: «Bu dövrlə bağlı müraciətlərimi yenə də hər bir Azərbaycan vətəndaşının arzuladığı sözlərlə yekunlaşdırmaq istəyirəm: Cəbrayıl bizimdir, Füzuli bizimdir, Zəngilan bizimdir, Qubadlı bizimdir, Ağdam bizimdir, Kəlbəcər bizimdir, Laçın bizimdir, Şuşa bizimdir, Qarabağ bizimdir! Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan!».**

Bir sözlə, bu gün xalqımız əmindir ki, müstəqil Azərbaycan **Heydər Əliyev** ideyaları işığında **Prezident** İlham Əliyevin rəhbərliyi ilə daha yüksək zirvələr fəth edəcək. Və **Heydər Əliyev** daim azərbaycanlıların qəlbində yaşayacaq, onun adı hər zaman milli fəxarət rəmzi kimi çəkiləcəkdir. Və bütün ömrünü xalqına bəxş etmiş **Heydər Əliyev** hər zaman insanların qəlbində yaşayacaq.



**Zərifə Quliyeva: Atamın ARZUSU həkim olmağım idi, mənim İSTƏYİM isə JURNALİST**

Xoşbəxtlik sərhəd tanımır.İçimdə jurnalistikaya maraq,həvəs,sevgi yox olmur. 1987-ci ildə rayon partiya komitəsinin katibi Rafiq Soltanov məni çağırıb dedi ki,işdən çıxmalısan. Aparatdan Ayaz Mütəllibovun tələbidir… Dedim, Heydər Əliyevin adına görə işdən çıxıramsa, bu mənim üçün şərəf və fərəhdir. Biz YAP-çılar öz əməli fəaliyyətimizlə Heydər Əliyevin xalqımızın qədirbilən insanlarına əmanət etdiyi iqtidar partiyasına kimlərinsə xələl gəriməsinə imkan verməməliyik. Hər zaman Ulu Öndər Heydər Əliyev siyasətini dəstəkləyir və sevərək təbliğ edirəm. Təəssüflə, qeyd etmək istərdim ki, müasir dövrümüzdə bəzi valideyn hesabına yaşayan,imkanlı ailələrdə böyüyən gənclərimizdə vətənə bağlılıq hisləri ürəkaçan deyil.Gəlin dünyada çoxsaylı ölümlərə səbəb olan pandemiya müharibəsində prezidentimiz və Birinci vitse-prezidentimizin tapşırıq və tövsiyyələrini yerinə yetirək."Bu və ya digər maraqlı fikirləri Azərbaycanın ictimai –siyasi fəal qadını, Yeni Azərbaycan Partiyasının qadınlar şurasının idarə heyyətinin üzvü, tərəqqi medallı həkim, "Modern ailə inkişaf" ictimai birliyinin sədri Zərifə xanım Quliyeva **Millixəbər.az-**a müsahibəsində deyib.

**-Zərifə xanım ilk öncə istərdik ki, örnək dolu həyat və fəaliyyətiniz haqqında bizim oxucularımıza danışasınız.**

Öncəliklə sizi salamlayır,həyat və fəaliyyətimlə maraqlandığınız üçün təşəkkür edirəm. Mən 1952-ci ilin 13 Fevralında qarlı-şaxtalı bir gündə Balakən rayonunda hərbçi ailəsində doğulub böyümüşəm. Ailəmiz o dövrdə atam hərbiçi olduğundan hara göndərirdilərsə biz də onunla gedirdik. Məsələn,bacım atam hərbi komissarlıqda çalışdığı dövrdə Ordubatda doğulub. Mən isə atamın işi ilə əlaqədar olaraq o zamanki ENKVB-nin Balakən regional idarəsinin rəisi işlədiyi dövrdə Balakəndə anadan olmuşam.Bacımla mən orta məktəbi atamın növbəti iş yeri olan Dövlət Təhlükəsizlik Komitəsinin **6 rayon üzrə Şirvan regional idarəsində rəis olduğu dövrdə Şirvan şəhərində oxumuşam.** Qardaşım isə Naxçıvanda təhsil alıb. Bir sözlə, ailəmiz atamın fəaliyyətinə uğyun olaraq hərəkət edib. Atam evdə ciddi rejim qurmuşdu. Sanki, anam atamın qoyduğu hərbi rejimə köklənərək qayda-qanundan kənara çıxmazdı. Ailədə üç uşaq idik – qardaşım, bacım və mən. Səhər yuxudan durub dərsə gedəndə hamımız səliqə ilə geyinib hazırlaşmalı idik. Kimsə səliqəsiz gözə dəysə, dərhal yenidən daranmağa göndərilirdi.Anam bizim nizam-intizamlı olmağımıza xüsusi fikir verirdi.Atamla anam ilk öncə olduqca vacib tərbiyyəvi əhəmiyyətli məqamlara belə diqqət edirdilər.

Atam işdən evə gələndə gözə görsənmirdik, yeməyini yeyib dincələndən sonra suallarımızı verməyə başlayırdıq. Atam çox məsuliyyətli işdə çalışdığı üçün anam bizim onu öz problemlərimizlə yükləməyə qoymurdu. Üçümüzün də birdən yanına getməyimizə izin verməzdi, bir-bir gedirdik. Biz o cür rejimdə böyümüşük. İndi özüm də bu rejimlə çalışıram.

Biz indiki dövrdə yaşayan məmur övladlarının bəzilərindən fərqli olaraq hər zaman bütün uğurlarımızı gərgin əziyyət və zəhmətin hesabına əldə etmişik. Gecəmizi-gündüzə qatıb kitab mütaliə etmişik, yorğunluq bilməmişik. Mən rəhbər vəzifələrdə çalışdığım dövrdə işçilərim hər gün səhər tezdən məni işdə görürdülər, hərdən deyirdilər ki, belə baş həkimmi olar? Əksər baş həkimlər saat 12-də işə gələr. Amma siz tez, hətta vaxtından əvvəl gəlirsiniz.Onlara deyirdim ki,artıq bu mənim həyat tərzimə çevrilib, beynim maşın kimi işləyir. Axşam hamı işdən gedəndən sonra özüm təmizliyə nəzarət edib sonra çıxıram. Atam biz məktəbdə oxuyanda deyirdi, eybi yox, mən

əziyyət çəkərəm, həftədə bir dəfə gəlib övladlarımı görərəm, amma məktəblərini dəyişməsinlər, bir məktəbdə oxusunlar. Jurnalistikaya çox marağım olub, məktəbdə də həmişə aktiv olmuşam…

Məktəb vaxtından jurnalistikaya həvəsim vardı, yazdığım inşalar da fərqlənirdi. Amma atamın bir istəyi vardı ki, övladlarından biri həkim olsun. Məndən fağırını tapmadılar (gülür). Düzdür, həyatda öz prinsipim olub, amma atamla anamın sözündən heç vaxt çıxa bilməmişəm.Atam çox təmkinli idi, bir sözü çox deməzdi, həyatda nəyə nail olmuşamsa, ona borcluyam.Mən məktəbi qızıl medalla bitirib, instituta imtahan verdim. 1969-cu ildə instituta qəbul oldum.

Həmin il ölkədə mühüm dəyişiklik oldu, Dövlət Təhlükəsizlik Komitəsinin sədri Heydər Əliyev Mərkəzi Komitənin sədri vəzifəsinə təyin edildi. Ölkə o zaman batıb gedirdi. İnsanlar çörək,yağ növbəsinə dururdular.Bütün sahələrdə boşluqlar var idi.Bu tarixi faktdır ki, Heydər Əliyev hər dəfə ölkənin çətin vaxtlarında hakimiyyətə gəlib və onu quyunun dibindən çıxararaq yüksəkliklərə qaldırıb. O sözün əsl mənasında ömrünün 60 ilini Azərbaycan xalqının xoşbəxtliyi və gələcəyinə həsr edib. Ulu öndər Heydər Əliyev Azərbaycanın memarı,qurucusu, xoşbəxtliyi, etibarlı gələcəyi, İLHAMLA irəliyə doğru gedən inamlı sabahıdır. Xatirimdədir ki, o zaman 18 yaşım var idi. Heydər Əliyev vaxtaşırı şəhərə çıxaraq hər bir sahə ilə yaxından maraqlanır, ciddi tapşırıqlar verirdi. Hətta o dövrdə Heydər Əliyev haqqında MİXAİLO şəhərdədir deyirdilər. İnsanlar Ulu öndər şəxsiyyətinə hörmət edirdilər, rüşvətsiz bir mühit formalaşmışdı. Təəsüflə qeyd etmək istərdim ki, indiki dövrümüzdə cənab Prezident İlham Əliyevin rüşvətxorluğa qarşı amansız mübarizəsinə baxmayaraq hələ də bəzi məmurlar işçilərin maaş kartlarına göz tikir,insanların haqqına girərək rüşvət alırlar. Bunun nəticəsi olaraq aidiyyəti üzrə güc strukturları bu cür neqativ halları peşəkarcasına aşkarlayaraq rüşvətxor məmurları cəzalandırırlar.

**-Universitetə necə qəbul oldunuz?**

– Balaca, arıq qız idim.İmtahana girdim, böyük auditoriyada 15 professor, akademik əyləşib imtahan götürürdü.Çox həyəcanlı idim. Rəhmətlik Zəhra Quliyeva da rektor idi .O ,çox gözəl insan idi. Bir epizodu da danışım, biologiya üzrə müəllim ,professor Sabir müəllim universiteti bitirməyimdən 40 il keçməsinə baxmayaraq, ömrümün axırına kimi onu yadımdan çıxarmayacağam.Elə həyatda ilk mübarizəm

də qəbul imtahanından başladı.Biologiya fənni üzrə professor Sabir müəllim mənə "4" vermək istəyirdi,mən isə bu ədalətsizliyə etiraz edirdim.Əsaslandırırdım ki, mən 5-ə layiq danışmışam.

Əgər o imtahandan "5" almasaydım o biri imtahanları da verməli idim. Məktəbi qızıl medalla bitirdiyim üçün bir fəndən imtahan verirdim. Həmin il biologiya fənni seçilmişdi. Tam hazırlaşıb gəlmişdim. Bilirsiniz ,o dövrdə Heydər Əliyev Azərbaycanda elə bir ciddi nəzarət, qayda-qanun yaratmışdır ki, heç bir vəzifəli şəxs ondan qırağa çıxa bilməzdi. Hətta o dövrdə ilk dəfə görürdük ki, radio vasitəsi ilə deyilirdi ki, imtahan nəticələrindən narazı olanlar komissiya sədrinə müraciət etsinlər, 3 sualdan ibarət təkrar imtahan üçün suallara cavab verməklə komissiya yaradılsın! Bilet çəkib imtahan üçün nəzərdə tutulmuş vaxtdan əvvəl nəyin ki, 3 suala, 5 suala mükəmməl cavab verdim, həmin professor yenə də qane olmadı, dedi ki, sualım var. Gördüm kənar suallar verdi, mən də "çekist" qızıyam axı, hiss elədim ki, məni çək-çevir etmək istəyir. Sonradan anladım ki, o, dövlət rəhbərliyinə əks-mövqedə dururmuş. 17 yaşında imtahan verən bir abituriyent kimi o epizodu heç vaxt yaddan çıxara bilmirəm. 14 nəfər hamısı "5" yazmışdı, bircə o professor razı deyildi. Qayda da beləydi, həmin professor mütləq "5" qiyməti yazmalıydı ki, imtahandan keçim. Özümdə cürət tapdım, dedim –" "4" lə razılaşmıram, Heydər Əliyev hakimiyyətə gələndə qəbulda belə bir qayda qoydu ki, kimin imtahandan narazılığı varsa, komissiyaya müraciət etsin". Təsəvvür edin, dedim-" bu stoldan durmayacağam,mən komissiya tələb edirəm". Sonradan özlüyümdə deyirdim ki, ay Allah, balaca canımla necə qəhrəmanlıq eləmişəm…

Xülasə, komissiya üzvləri gəldi, onların da 3 sual verməyə ixtiyarları vardı, bütün sualları cavablandırdım. Komissiya sədri dedi ki, "5" yazırıq, hələ yanına üstəgəl işarəsi də qoyuruq.

Aşağıda anam, qohumlarım məni gözləyirdi. Necə stress keçirmişdimsə, çıxanda hönkür-hönkür ağladım. Rəhmətlik anam dəli oldu, elə bildi kəsilmişəm. Qalmışam qıraqda, qeydimə qalmır, deyir necə oldu kəsildin, atana necə cavab verəcəksən? Dedim "5" almışam. Anam məni qucaqladı... Sonra atamı Bakının Nərimanov rayonuna rəis təyin elədilər, artıq o vaxt instituta qəbul olmuşdum.

Onu da qeyd edim ki, Tibb İnstitutunda oxuyanda aktiv komsomolçuydum, komsomol katibi, qrup nümayəndəsi oldum.

Bələliklə,mükəmməl tibbi biliklərə yiyələnərək tibb institunu öz biliyimlə bitirərək diplomumu aldım. Diplomumu Atama göstərəndə o çox sevindi, mənimlə fəxr etdi. Onu da deyim ki, o vaxtlar savada,biliyə çox fikir verirdilər,oxuyanlar arasında sağlam rəqabət mühiti var idi. Ona görə də gecəmizi-gündüzə qatıb oxuyurduq. O zamalar tibb sahəsində təshil alan tələbələrin terapevtliyə meyilliyi çox az idi.Tələbələr daha çox tibbin ginekologiya,cərrahiyyə sahəsinə həvəs göstərirdilər.Mən isə terapevtliyi seçdim. Bütün bunlarla yanaşı içimdə jurnalistikaya maraq, həvəs,sevgi yox olmurdu, tükənmirdi.5 nömrəli klinik xəstəxanada həkim işləyirdim, nyaxşı mənada peşəmin bilicisi idim.Təvazökarlıqdan uzaq da olsa deyim bizim palataya xəstələr gələndə məni axtarırdılar. Posientlərdən topladığım anemnez nəticəsində düzgün müalicə metodu seçirdim, bu da xəstənin tez bir zamnada sağalmasına səbəb olurdu.Xəstəxanadaxili tibbi müzakirələrdə müalicə metodum bəyənilirdi.Hər dəfə xəstəyə qoyduğum diaqnoz müsbət nəticə verdikdə sevincimin həddi-hüdudu olmurdu. O zaman 5 Saylı ən böyük xəstəxana idi. İndi şükürlər olsun ki, Prezidentimiz İlham Əliyev və Birinci vitse-prezident Mehriban xanım Əliyevanın səhiyyə sahəsinə diqqət və qayğısının nəticəsində böyük tibb ocaqları yaradılıb.Hazırda ölkəmizdə tibbin hər bir sahəsini əhatə edən müasir tipli xəstəxanaların sayı günbəgün artır.

Eyni vaxtda həkimliklə yanaşı rayon partiya komitəsinin işlərində o qədər fəal oldum ki, məni ideoloji şöbəyə baş təlimatçı götürdülər. Hər dövrün müsbət və mənfi cəhəti var. Amma o dövrdə mən məktəb keçdim, o məktəb məni indi hər yerdə başı uca edir. Rayon partiya komitəsində aldığım təcrübədən çox məmnunam. Dövlət rəhbəri Heydər Əliyev idi, ulu öndərimizin dövlət quruculuğu ilə bağlı elə ciddi proqramı vardı ki, bizim nəsil o proqramla yetişdi.

**-Sonrakı dövrdə özünüzü jurnalist kimi sınadınızmı?**

-Bəli ,yazdım, çox yazdım. Referendum öncəsi, Milli Məclisə seçki qabağı, Xocalı soyqırımı, 20 Yanvar hadisələri ilə bağlı çoxlu məqalələrim dərc olunub. "Nicat günü" adlı kitabımda Ulu öndərin xalq tərəfindən hakimiyyətə necə gətirilməsindən bəhs eləmişəm, çox hörmətli birinci xanımımız Mehriban xanımla bağlı məqalələrim var.Sonra bunu demək nə qədər acı da olsa rəhmətlik oğlumla bağlı kitab yazmışam. Jurnalistika hələ də canımda qalıb.Sənətimi nə qədər sevdimsə jurnalistika peşəsini də eyniliklə sevdim (gülür).



Jurnalistlərlə səmərəli dostluq və əməkdaşlıq edirəm. Həyatımda enişli-yoxuşlu yollar çox olub. Heç kəs deyə bilməz ki, həyat dümdüz, hamar yoldur…

**– Kənardan baxanlar haqqınızda sizcə necə düşünürlər?**

-Hər bir insan bir cür düşünə bilər, amma çətinliyimiz çox olub. Atamı 65 yaşında itirdik, o vaxt çox gənc idik, həmişə ata-ana himayəsində olmuşduq. Anam evdar qadın idi, atam onu da çox əziz saxlamışdı.

**-Atanızın şərəfli ömür yolundan istərdik daha ətraflı danışasınız.**

– Atam o qədər məsuliyyətli insan idi ki, gənc yaşlarından öz vəzifəsində irəliləmişdi. 1915-ci ildə Ermənistandan didərgin düşmüş insanlar Naxçıvanda məskunlaşmışdılar. Atam yolda ikən atasını, anasını itirmişdi. 5 yaşında uşağın qucağında ölmüşdü babam. Atam o köçü ağlaya-ağlaya danışırdı, deyirdi, atamı qucağımda itirdim. Qarın içində ayaqyalın əzab və müsibətlə Naxçıvana gəlib çıxıblar. Atam bibisinin himayəsində böyüyüb.

Allah rəhmət eləsin İzzət xanıma! onun 6-7 qardaşından yadigar qalan atam Rzaqulu olub, bir qardaşının oğlu sağ qalıb.

Atamın əmilərini qırğın vaxtı ermənilər öldürüb, yolda ölənlər, itənlər də olub. Yalnız atam bacısı ilə gəlib Naxçıvana çıxıb. O vaxt artıq İzzət bibigil də Naxçıvanda məskunlaşmışdılar. Atam gecə səhərə qədər vaqonlara yük daşıyıb, fəhləlik edib, gündüz məktəbə gedib. 24 yaşında artıq Naxçıvanda hərbi komissarın müavini olub.

Sonra prokuror müavini kimi çalışıb. Öz zəhməti ilə vəzifələrə gəlib çıxıb. Fəallığına və savadına görə onu Naxçıvandan Dövlət Təhlükəsiz Komitəsinin akademiyasına göndəriblər. Oxuyub geri qayıdıb və o vaxtdan həmişə vəzifələrdə olub.

Çətin həyatını həm bizə dərs vermək, örnək olmaq üçün danışırdı, həm də o hadisələri yadından çıxarmırdı. Atam hamıya kömək edərdi. Rayonlarda işləyəndə katibin, polisin yanına gedən olmurdu, kimin nə dərdi vardı, atamın qəbuluna gəlirdi. Hansısa rayona getsəm, eşidəndə ki Rzaqulu kişinin qızıyam, məni çox hörmətlə qarşılayırlar. Bu, tarixdir, heç vaxt da deməmişəm, soruşduğunuz üçün danışdım.

Onu da deyim ki, hərdən anam şikayətlənirdi ki, nə olub, yenə kim sənin qanını qaraltdı? Atam qayıdırdı ki, yanıma şikayətə gələn adam göz yaşı içində olanda öz uşaqlarımı düşünürəm. Mən həyatda olmayanda birdən uşaqlarım kiminsə yanına gedər, müsbət cavab almaz, göz yaşı axıdar. Daim uşaqlarımı fikirləşirəm ki, elə ad qoyum gedim, övladlarım kiminsə qabağında ağlamasın. Bu söz həmişə qulağımızda qalıb.

Mən də, bacım-qardaşım da, kimsə nədəsə kömək istəyirsə, əlimizdə ixtiyar varsa, yardım etməyə çalışırıq. 1994-cü ildə metro partladılanda dövlət zərərçəkənlərə kömək edirdi. O vaxt dövlətin zəif vaxtı idi, Heydər Əliyev ölkəni güclə ayağa qaldırırdı.Xatirimdədir ki, 1995-ci ildə bir qadın yanıma gəlmişdi, mən o vaxt Nəsimi rayon Səhiyyə şöbəsinin müdiri işləyirdim. Ağlaya-ağlaya dedi ki, qızım təzə nişanlanmışdı, nişanlısı ilə birgə metroda həlak olublar. Bir ildir dünyasını dəyişiblər, amma onların qəbrinin üstünü götürə bilmirəm.

Düşündüm ki, bu məsələni özüm yoluna qoya bilərəmsə, niyə etməyim. Bunu reklam üçün demirəm, sadəcə bildirmək istəyirəm ki, ürəyimin yumşaqlığından, dərdli adamın yerinə özümü qoydum.

Öz maliyyə hesabıma həmin qadının övladının qəbir daşını düzəltdik, getdik, Yasin də oxutduq. Anadır, qoy ürəyi sakitləşsin, heç olmazsa, dərdini unutsun…

Atam Heydər Əliyevin dayısı və ən yaxın məsləkdaşı, dostu idi…

**– Ulu öndər Heydər Əliyevi bir qohum kimi necə xatırlayırsınız?**

-Ulu öndərimizi lap uşaq vaxtımdan xatırlayıram… Axı, biz yaxın qohumuq. Bir epizoddan bəhs edim, anamla atam danışırdı ki, sən doğulanda Heydər Əliyev rəhmətlik Zərifə xanımla təzə tanış olubmuş, nişanlanmaq üçün plan qururmuşlar, mən də 5-6 aylıq olmuşam. Onu

da deyim ki, atamla Heydər Əliyev qohumluqdan əlavə yaxın dost idilər.

Atam Heydər Əliyevin dayısı idi, amma aralarında 9 yaş fərqi vardı, sirləri-sözləri bir idi. Atama böyük kimi hörmət edirdi, ondan məsləhət alırdı, yaxın sirdaş idilər. Heydər Əliyev çox göyçək oğlan olub, Naxçıvanda onun kimi yaraşıqda başqa gənc olmayıb,hündürboy, mavi gözlü, həmişə şıq geyimli. Küçədən gedəndə bütün Naxçıvan əhli ona tamaşa edirmiş.

Anam danışırdı ki, uşaqlara yaxın olmayan Heydər Əliyev bizə gələn kimi səni, yəni məni götürüb göyə atıb-tutur, deyirmiş "ay Zərişkam, Zərifiçkam mənim" (gülür). Deyir, biz də başa düşmürdük ki, sənə niyə bu qədər yaxındır, sonradan məlum olub ki, sevgilisinin adı Zərifədir. Heydər Əliyev uşaqların arasında həmişə mənə fərqli baxıb. Qohumlarla görüşəndə çoxlu söhbətlər edərdik, mən də çox danışan idim, hər şeydən suallar verirdim. Deyirdi, dayı, sənin qızın çekist olmalıdır. Sonra da Heydər Əliyevin məsləhəti ilə Rayon partiya komitəsinə işləməyə getdim. 1987-ci ildəsə mənə dedilər ki, vəzifədən çıxmalısan. Yadınızdadır, o vaxt Ulu öndər öz ərizəsi ilə vəzifədən getmişdi. Heydər Əliyev çox uzaqgörən insan idi, bilirdi ki, Qorbaçovun apardığı ideoloji xətt iflasa gedir. O, 20 il sonranı görürdü ki, nə olacaq. Heydər Əliyev heç vaxt xəstə olmayıb, güclü orqanizmi vardı. Postunu öz ərizəsi ilə tərk elədi. Bilirdi ki, öz xalqına nə vaxtsa lazım olacaq.

20 Yanvar hadisələrindən sonra onun Moskvada keçirdiyi mətbuat konfransı insanlara ruh verdi, ürək verdi, xalqı ayağa qaldırdı. O hadisələr gözümün qabağındadır, Bakıda bir maşın işləmirdi, paytaxt ölü şəhərə çevrilmişdi. Yanvarın 22-də şəhidlər dəfn edildi, dəfnə qədər ölkə rəhbərliyindən heç bir bəndə nə başsağlığı verdi, nə də xalqa dayaq durdu. Öz aramızdı, Allahşükür Paşazadə də şəhidlər basdırılan gün millətin qarşısına düşüb dəfnə getdi. Mən 8-ci kilometr qəsəbəsindən, Nizami rayonundan Şəhidlər Xiyabanına piyada gəldiyimizi xatırlayıram. Böyük axın vardı, hər kəs şəhidləri dəfn etməyə gəlirdi.

Xalqın ağır günündə Heydər Əliyevin mətbuat konfransı keçirməsi inqilabi hərəkət idi, cəsarətli addım idi. Xalq bildi ki, onun qeydinə qalan, arxasında duran böyüyü var. 1990-cı illərdə də Azərbaycanı parçalamaq istəyirdilər, kimi xanlıq, kimi quberniya qurmaq istəyirdi.

Heydər Əliyev xalqın təkidi ilə Bakıya gəldi. Azərbaycanı odun-alovun içindən çıxardı, hər sahədə – iqtisadiyyat, səhiyyə, təhsil, mədəniyyət, turizm, təsərrüfat, neft sektorunda inkişaf başladı. Azərbaycanın tarixi Ulu öndərimizlə bağlıdır. Heydər Əliyev Azərbaycanın memarıdır. Möhtərəm prezidentimiz İlham Əliyev də bu ideologiyanı çox böyük uğurla aparır.

1987-ci ildə rayon partiya komitəsinin katibi Rafiq Soltanov məni çağırıb dedi ki, işdən çıxmalısan. Aparatdan Ayaz Mütəllibovun tələbidir…

-1975-76-cı illərdə… Nəisə, Rafiq Soltanov dedi ki, Heydər Əliyevin qohumusan, işdən çıxmalısan. Dedim, Heydər Əliyevin adına görə işdən çıxıramsa, bu, mənim üçün şərəf və fərəhdir.Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi dövrdə gənclərimizi xarici ölkələrə göndərirdi ki, onlar daha yaxşı təhsil alıb vətənimizə xidmət etsinlər. Bunlardan biri də Cəmşid Naxçıvanski adına hərbi lisseyin yaradılması idi.Bu özü milli hərbi kadrların yetişməsində müstəsna əhəmiyyət kəsb edirdi.

Gənc idik, nə biləydik bir neçə il sonra Heydər Əliyev yenidən hakimiyyətə gələcək. Bir müddət işsiz qaldım. Həyat pislərlə əhatə olunmayıb, yaxşılar da var. Atamın yaxşılıq elədiyi bir insan vardı, heç bizim millətin nümayəndəsi də deyildi, yəhudi əsilli bir xanım idi, Bakı şəhər Baş Səhiyyə İdarəsində işləyirdi. Mənə dedi ki, sənə kömək edəcəyəm,sizin atanızın mənə yaxşılığı keçib. Söylədi ki, Keşlə maşınqayırma zavodunda Tibbi-sanitar hissənin müdiri vəzifəsi boşdur, orada işlə. Sevincimdən yerə-göyə sığmırdım. Həmin dövrdə atam artıq dünyasını dəyişmişdi,qardaşım Rusiyada yaşayırdı.Sosial durumumuz yaxşı deyildi. Çünki evdə anam, özümün bir oğlum və bacımın qızı mənim öhdəmdə idi, deyirdim dörd nəfər necə yaşayarıq?

1988-89-cu illər meydan hərəkatı dövrü ölkəmizdə siyasi gərginlik yaşanırdı, insanlarımızın sosial-iqtisadi vəziyyəti getdikcə ağırlaşırdı,insanlar iş tapa bilmirdilər, bax belə bir dövrün acılı günləri bizdən də yan keçmədi.

Mən zavodda çalışdığım ildə elə hallar olurdu ki…

Zavod Moskva prospektində yerləşirdi , oradan evə – "Gənclik" metrosuna ,piyada gəlirdim. 20 qəpiyi avtobusa verməyə heyifim gəlirdi, deyirdim, evdə iki balaca uşaq var, onlara çörək, qoğal alıb apararam.

**GƏNCLƏRƏ TÖVSİYYƏM...**

Mən indiki gənclərimizə demək istəyirəm ki, torpağınızı, vətəninizi sevin!

Ailənizi,qədirbilən dövlət rəhbərinizi, bayrağınızı, gerbinizi sevin! Bu sevgi hissi olmayan insanlarda vətənpərvərlik ola bilməz.

Yaşayıb yaratdığımız torpağa ana vətən deyirik,bayrağımızı yüksəkliklərə qaldırırıq, bu hər birimizin vətəndaşlıq borcudur. Təəssüflə qeyd etmək istərdim ki, müasir dövrümüzdə bəzi valideyn hesabına yaşayan,imkanlı ailələrin övladlarında böyüyən gənclərimizdə vətənə bağlılıq hissləri ürəkaçan deyil.

Xaricə təhsil alan gənclərə demək istəyirəm, ki, qazandığınız bilikləri öz vətininizə dönərək xalqımız üçün ürəklə,qəlblə edin.Bu sizin övladlıq, vətəndaşlıq borcunuzdur.

**-Bildiyimizə görə atanızın peşəsini oğlunuz da davam etdirib , bu doğrudurmu?**

Bəli, tamamilə doğrudur. Amma oğlum da, öncə qardaşım təhlükəsizlik orqanlarında çalışıb.Qardaşım Bakıda keçmiş Azərbaycan Neft kimya institutunu(AZİ) bitirdikdən sonra Moskvaya gedərək Təhlükəsizlik akademiyasına daxil olub. Uzunmüddət təhlükəsizlik orqanlarında çalışaraq polkovnik rütbəsinə yüksəlib. Sovet ittifaqı dağıldıqdan sonra orada xidmət göstərməkdən imtina edərək doğma vətənimizə gəldi, bir müddət Xarici işlər Nazirliyində fəaliyyət göstərdi. Cənab Prezidentin sərəncamı ilə 4 ildir ki, Azərbaycanı səfir olaraq Özbəkistanda təmsil edir.Hazırda onun oğlu polkovnik rütbəsi ilə yolunu davam etdirir. Oğlum da atasının,dayısının şərəfli peşə yolunu sevərək gedirdi, vətənə xidmətdən zövq alırdı, əsl millətsevər bir övlad idi, vaxtsız ölüm onu aramızdan tez apardı. Neyləmək olar ,bu da bir alın yazısıdır.

**Gözümün işığı olan bir oğlum vardı…**

Mənim taleyim enişli-yoxuşlu olub. Həyatımın mənası, gözümün işığı olan bir oğlum vardı… Orxanıma o qədər bağlı idim ki. 2004-cü ildə 29 yaşında onu itirdim, böyük faciələrdən keçdim…

Oğlum atamın xətti ilə dövlət təhlükəsizlik orqanlarında çalışırdı, sonra profilini dəyişdi, vergi sisteminə keçdi. Bakı şəhər vergilər departamentində baş müfəttiş vəzifəsində



işləyirdi, çox mərhəmətli idi. Hansısa müəssisədə narazılıq görürdüsə, deyirdi, gedirəm, qayıdacağam, o vaxtadək işləri səliqəyə salın. Biz həmyaş kimi görünürdük, mənə Zərifə deyə müraciət edirdi.

2004-cü il mayın 1-də təqdimat olmalı idi, işindəki uğurlara görə fəxri fərman veriləcəkdi, çox həyəcanlı idi, geyinib-keçinib evdən çıxmaq istəyirdi ki, təzyiqi qalxdı, bir saniyədə oğlumu itirdim... Oğlumu itirəndən sonra bütün fəaliyyətim dayandı, taleyimi qələmə aldım. 2 ildən çox hər gün yas içində oldum. Hər gün qəbiristanlığa gedirdim, hər cümə axşamı ehsan verirdim. Uşaq evinə, qocalar evinə ehsan aparırdım.

**-Ümumiyyətlə, YAP-da və vəzifə pillələrində hansı irəliləyişlərə nail oldunuz?**

-Yeni Azərbaycan Partiyası yaradılanda mən də əlimdən gələn köməyi elədim. O vaxtkı Moskva prospektində 20-dən çox zavod vardı, biz də fəhlələri müayinə edirdik. Təbliğat aparırdıq. Keşlə maşınqayırma zavodunda Yeni Azərbaycan Partiyasının özəyini təşkil etdik. Hazırda Azərbaycan Dəmir Yolları idarəsində Yeni Azərbaycan Partiyası yerli təşkilatının sədri Xeyrulla Hümbətov onda gənc idi, biz təşkilatlanmağa başladıq. YAP Qadınlar Şurasının sədri olmuş Səyyarə xanımla Yeni Azərbaycan Partiyasının yerlərdə təşkilatını qurmağa

yardım edərək Zavodlara gedirdik, 2-3 nəfər razı olan kimi dərhal ərizəsini alırdıq.

Hətta bir dəfə mənə qəsd oldu. Zavoda işə gedəndə məni izləyirmişlər, qapıdan bayıra çıxanda zərbə endirdilər. 2-3 gün yatdım, Allah məni qurtardı, çox fəsadlar olmadı, sonradan bildim kimlərdir, arxasınca getmədim.

Yeni Azərbaycan Partiyasının nizamnaməsi Ulu öndərin imzası dəsti-xətti ilə Naxçıvanda çətin şəraitdə yaradılıb. Biz YAP-çılar öz əməli fəaliyyətimizlə Heydər Əliyevin xalqımızın qədirbilən insanlarına əmanət etdiyi iqtidar partiyasına kimlərinsə xələl gərimərinə imkan verməməliyik.YAP-ı daha da gücləndirməli və etimadı doğrultmaqda yolumuzu davam etməliyik.

-Bu gün YAP sədri cənab İlham Əliyev tərəfindən önəmli kadr islahatları aparılır. Dövlət tərəfindən gənclərə inam və güvən artırılaraq geniş meydan verilir.Mən hesab edirəm ki, bu prosesdə gənclərlə yanaşı təcrübəli yaşlı təbəqənin nümayəndələrinin də bilik və təcrübəsindən ölkəmizin inkişafı, ictimai-siyasi fəallığın artırılması üçün istifadə edilməlidir. Məsələn rəhbərlik etdiyim "Modern aiilə inkişaf" təşkilatı hər bir əlamətdar tarixi günlərlə bağlı ölkəmizin aparıcı ziyalı simalarının iştirakı ilə möhtəşəm tədbirlər keçirir və ictimai-siyasi proseslərə öz aktiv münasibətini ifadə edir.Onu da qeyd edim ki, "Modern ailə inkişaf" ictimai birliyinin adını möhtərəm Prezidentimiz İlham Əliyevin ailənin formalaşması və yeni model ailə ilə bağlı çıxışından götürdüm və belə bir QHT yaratdım.

1993-cü ildə Heydər Əliyev xalqın təkidi ilə rəhbərliyə gəldi, həmin ilin oktyabrında prezident seçkisi oldu, mən hələ zavodda çalışırdım. Heç vaxt vəzifə dalınca qaçmamışam. Bəlkə mənim yerimə kim olsaydı, vəzifə istəyərdi. Deyirdim, təki dövlətimiz güclü olsun, Heydər Əliyev işində olsun. Düşünürdüm, insanlara etibar yoxdur, birdən vəzifəyə gələrəm, sonra bir şey olar, Heydər Əliyevin adına söz gələr...

**-Sizcə qadın özünü nə zaman xoşbəxt sayır və bizim tanıdığımız dəyərli, hörmətli, xanım-xatun Zərifə Quliyeva xoşbəxtdirmi?**

-Hər bir insan həyatda bir az da olsa nəyəsə nail ola bilirsə özünü xoşbəxt hesab edir.Xoşbəxtlik sərhəd tanımır.Misal üçün, özüm haqqında tam səmimiyyətlə deyim ki, mənəvi dəyərləri özündə ehtiva edən bir ailədə doğulmuşam,ailəm mənə gözəl tərbiyə verib,vətənimə ləyaqətlə xidmət etmişəm,vətənimi sevmişəm, istədiyim jurnalistika sahəsində müəyyən qədər arzularımı gerçəkləşdirmişəm.Uzun illər çalışdığım tibb sahəsində heç vaxt yanılmamışam ,başı uca gəzmişəm. Hər şeydə üzüağ çıxmışam.İnsanlara təmənna ilə deyil, sevgi ilə yanaşmışam.Mən bunu fəxrlə deyə bilərəm ki, səhiyyə sahəsində öndə gedən səhiyyə işçilərindən olmuşam. Səhiyyə sahəsində 37 ilə yaxın uğurlu fəaliyyətimə görə ölkə Prezidenti cənab İlham Əliyevin imzası ilə TƏRƏQQİ medalına layiq görülmüşəm.Bundan şərəfli nə ola bilər mənim üçün. Mən bu gün qürurla deyə bilərəm ki, atam Rzaqulu Quliyev mənə təmiz ad,soyad qoyub və mən də bu ad, soyadı doğruldur-am.Atamdan mənə miras qalan təlim-tərbiyədən irəli gələrək xalqımı, dövlətimi, Prezidentimi sevirəm. Hər zaman Ulu Öndər Heydər Əliyev siyasətini dəstəkləyir və sevərək təbliğ edirəm.Heydər Əliyev siyasi kursunu bu gün uğurla həyata keçirən ailəsinin xalqımızın xoşbəxtliyi naminə usanmadan etdikləri işləri görərək onları sevirəm.

Mən dövlətim və xalqım üçün gördüyüm işlərdə təmənna güdmür,bunu vətənsevər Azərbaycan qadını olaraq özümə borc bilərək edirəm.

Bir ana, ictimai-siyasi fəal Azərbaycan qadını olaraq ƏZİZ XALQIMIZA üz tutaraq demək istəyirəm ki, ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanın xoşbəxt gələcəyi naminə gördüyü əvəzolunmaz işləri bu gün **dövlət Başçımız, Prezidentimiz, Ali Baş Komandanımız cənab İlham Əliyev, Birinci vitse-prezident,"Heydər Əliyev Fondu" nun prezidenti Mehriban xanım Əliyeva** uğurla davam etdirirlər.

**Zərifə Quliyeva**
**TƏRCÜMEYİ - H A L**

**Quliyeva Zərifə Rzaqulu qızı** 13 fevral 1952-ci ildə Azərbaycan Respublikasının Balakən rayonunda anadan olmuşdur. 1959 - cu ildə Naxçıvan şəhər 4 saylı orta məktəbin 1-ci sinfinə daxil olmuş, 1969-cu ildə Əli Bayramlı (indiki Şirvan) şəhər orta məktəbini bitirmişdir. 1969-cu ildə N.Nərimanov Azərbaycan Dövlət Tibb İnstitututunun müalicə-profilaktika fakultəsinə daxil olmuş, 1976-cı ildə bitirmişdir. İlk əmək fəaliyyətinə 1975-cı ildə Bakı şəhər 5 saylı kliniki xəstəxanasında həkim-interna kimi qəbul şöbəsində həkim işləməklə başlamış, 1981-ci ildən 1984-cü ilədək həmin xəstəxanada qəbul şöbəsinin müdiri vəzifəsidə çalışmışdır. 1984-cü ildən 1989-cu ilədək Nizami rayon partiya komitəsində təlimatçı vəzifəsində işləməklə, səhiyyə, təhsil mədəniyyət sahəsinin kuratoru kimi geniş fəaliyyət göstərmişdir. 1989-cu ildən 1995-ci ilədək Nizami rayon 17 saylı tibbi-sanitar hissənin baş həkimi vəzifəsində işləmişdir. 1990-1993-cü illərdə mənfur erməni işğalçılarına qarşı Qarabağ müharibəsi dövründə atəşkəs imzalanana qədər on minlərlə insana qan yardımı proqramını təşkil etmiş, bu işin Qanköçürmə institutu tərəfindən yerinə yetirilməsinə nail olmuşdur.

2003-cü ildə *Vətən andı* ictimai-siyasi qəzetinin keçirdiyi sosial sorğunun nəticələrinə görə fəxri diploma, vətənimizin ümummilli problemi olan Qarabağ məsələsində tutduğu vətəndaşlıq mövqeyinə, şəhid ailəl?ri, əlillər və qaçqın soydaşlarımıza göstərdiyi təmənnasız və mənəvi köməkliyə görə 2005-ci ildə Azərbaycan Respublikası Qarabağ həqiqətləri Media mükafatına layiq görülmüşdür.

1995-ci ildən 2006-cı ilin fevral ayınadək Nəsimi rayon Səhiyyə şöbəsinin müdiri vəzifəsində çalışmışdır. 2006-cı ilin aprel ayında Azərbaycan Respublikası Səhiyyə Nazirliyi tərəfindən səhiyyə şöbələri ixtisar edilmişdir.

Z.R.Quliyeva səhiyyə sistemində çalışdığı uzun illər ərzində respublikamızda səhiyyənin inkişafı üçün səmərəli fəaliyyətinə, əhalinin sağlamlığının qorunması sahəsində uzunmuddətli qüsursuz xidmətlərinə, fədakar və nümunəvi əməyinə görə 2000-ci, 2003-cü illərdə Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin Fəxri Fərmanlarına layiq görülmüşdür.

2006-cı ilin fevral ayından 01.05. 2017-ci ilə kimi *Seba* Fito-Tibb* Koreya Şərq Təbabəti klinikasının baş həkimi vəzifəsində çalışmışdır. 2006-cı ilin iyun ayından 2018-ci ilin noyabr ayına kimi Nizami rayonunda yerləşən *K&Z

Kosmetoloji klinikası* MMC-nin baş həkimi vəzifəsində işləmişdir. 1992-ci ildə Yeni Azərbaycan Partiyasının sıralarına daxil olmuşdur. 1995-ci ildə YAP Nəsimi rayon şöbəsi idarə heyətinin üzvü və YAP qadınlar şurasının sədr müavini seçilmişdir.

2014-cü ilin may ayında YAP Qadınlar Şurasının konfransında Respublika YAP Qadınlar Şurası İdarə heyətinin üzvü seçilmişdir. Yeni Azərbaycan Partiyasının yaradılmasında və onun fəaliyyətində, eyni zamanda respublikamızın ictimai-siyasi həyatında fəal iştirakına görə 2007-ci ildə Yeni Azərbaycan Partiyası Nəsimi rayon təşkilatının Fəxri Fərmanına layiq görülmüşdür. 2008-ci ildə Nəsimi rayon ağbirçək və fəal qadınlar şurasının sədri vəzifəsinə seçilmiş və hazırda da bu işi davam etdirir.

Zərifə Quliyeva həm də Respublika YAP Veteranlar Şurasının üzvüdür.

Z.R.Quliyeva 2013-cü ildən hal-hazıradək *Modern İnkişaf və Ailə* İctimai birliyinin sədri vəzifəsində çalışır.

Zərifə xanım Quliyeva bu cəmiyyətlərin sədri olaraq qadın hüquqlarının və gənc ailələrin hüquqlarının qorunması və onların cəmiyyətdə rolunun artılıması istiqamətində əlindən gələni əsirgəmir. O, rəhbərlik etdiyi bu cəmiyyətlərin fəal üzvləri ilə birlikdə mütamadi olaraq internat məktəblərdə,*Ümid yeri* uşaq cəmiyyətində, qocalar evində olur, şəhid, əlil və imkansız ailələrə baş çəkir, onların problemləri ilə yaxından maraqlanır, bu problemlərin həlli istiqamətində imkan daxilində öz köməkliyini göstərir.

O, 10 oktyabr 2017 ci ildə *Ambasodor* otelində *Müstəqillik günü* və Yeni Azərbaycan Partiyasının 25-ci ildönümü ilə bağlı şəhid ailələri, Qarabağ əlilləri,Çernobıl əlilləri ilə görüş keçirmiş, onlar üçün ehsan süfrəsi açaraq onlara müxtəlif hədiyyələr və maddi yardım göstərmişdir. Bakı Biznes Mərkəzində Dünya Azərbaycanlılarının həmpəylik günü, 15 İyun - Qurtuluş günü, *Xocalı soyqırımı*, Uli Öndərin 100 illiyi ilə bağlı silsilə tədbirlər keçirmişdir. O, həmişə bu tədbirlərə şəhid ailələrini, Qarabağ müharibəsinin iştirakçılarını, imkansız ailələri dəvət edərək onlara maddi və mənəvi dəstək olmuşdur.

16 may 2018-ci il tarixdə Ulu Öndər Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü, 24 may 2023-cü il tarixdə Ulu Öndərin 100 illiyi ilə bağlı və Azərbaycan Cumhuriyyətinin 100 illiyi münaisbətilə Bakı Biznes mərkəzində Nəsimi rayon ictimaiyyətinin və şəhid ailələrinin iştirakı ilə geniş tədbirlər keçirmişdir.

*20 Yanvar* faciəsi zamanı həlak olmuş şəhid ailələri və əlillər, həmçinin 2016-cı il aprel döyüşləri və Qarabağ müharibəsində şəhid olanların ailələri

və qazilər üçün ehsan süfrələri açır və onlara maddi və mənəvi dayaq olur.

Yeni Azərbaycan Partiyası qurultayının 6 dəfə (1999, 2001, 2005, 2008, 2013, 2018-ci illər) və 6 dəfə (1998, 2003, 2008, 2013, 2018, 2023-cu illər) müstəqil Azərbaycan Respublikası Qadınlarının qurultayının nümayəndəsi seçilmişdir.

*Dirçəliş* qəzetinin 2007-ci il üzrə keçirdiyi müsabiqədə *İlin işgüzar adamı* adına, 2008-ci ildə isə *Hippokrat* tibb jurnalı redaksiyasının təsis etdiyi *Bacarıqlı əllər* diplomuna layiq görülmüşdür. 2009-cu ildə *Vektor* Beynəlxalq Elm Mərkəzinin *XXI əsrin tanınmış ziyalısı* Beynəlxalq diplomu ilə təltif olunmuşdur. 2009-cu ildə *Sahibkar hüquqları* beynəlxalq ictimai-siyasi hüquq qəzetinin və *Rəsmi Azərbaycan* ictimai-siyasi hüquq qəzetinin fəxri diplomlarına, 2010-cu ildə Azərbaycan *Azad qələmlər* cəmiyyətinin *Şəfalı əllər* fəxri mükafatına,

2010-cu ildə Azərbaycan Jurnalistləri Həmkarlar İttifaqının *Xalqın ən nüfuzlu ziyalısı* fəxri diplomuna, 2013-cü ildə *İdeal Sülhün Təbliği* Fondunun *Qalib Sultan* diplomuna layiq görülmüşdür.

Ölkəmizin ictimai-siyasi həyatında və Yeni Azərbaycan Partiyası Nəsimi rayon təşkilatının həyata keçirdiyi layihələrdə fəal iştirakına görə 01 mart 2012-ci ildə Yeni Azərbaycan Partiyasının diplomu ilə təltif edilmiş, Nəsimi rayonunun ictimai işlərində fəal iştirakına görə 13 fevral 2012-ci ildə Nəsimi rayon İcra hakimiyyətinin Fəxri Fərmanına layiq görülmüş, Yeni Azərbaycan Partiyası Nizami rayon təşkilatının ictimai-siyasi həyatında fəal iştirakına görə 01 mart 2012-ci ildə Fəxri Fərmanla təltif edilmiş, 6 noyabr 2012-ci ildə Yeni Azərbaycan Partiyasının yaradılmasının 20 illik yubileyi münasibətilə YAP Nəsimi rayon təşkilatının diplomuna layiq görülmüşdür.

19 noyabr 2012-ci ildə Yeni Azərbaycan Partiyasının yaranmasının 20 illik yubileyi münasibətilə Azərbaycan Kütləvi İnformasiya Vasitələri İşçilərinin Həmkarlar İttifaqı Rəyasət heyətinin və Yeni Azərbaycan Partiyası Nəsimi rayon təşkilatının Diplomların il? t?ltif edilmisdir.

31 dekabr 2012-ci ildə Dünya Azərbaycanlılarının Həmrəylik günü münasibətilə Azərbaycan Kütləvi İnformasiya Vasitələri İşçilərinin Həmkarlar İttifaqı Rəyasət heyətinin *İnam Şərəf Diplomu*na layiq görülmüş, səhiyyə sahəsində uzun müddət səmərəli fəaliyyətinə və xeyriyyəçilik işlərinə görə *Mərhəmət elçisi* beynəlxalq ictimai-siyasi, elmi-hüquqi jürnalının *İbn Sina* fəxri diplomuna, 2016-cı ildə, 2017-ci ildə dövlət, ailə, qadın və uşaq siyasətinin həyata keçirilməsində fəal əməkdaşlığa və səmərəli fəavliyyətinə görə Azərbaycan Respublikası Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət

Komitəsinin Fəxri Fərmanına və Diplomuna layiq görülmüşdür.

Respublikanın ictimai-siyasi fəaliyyətində fəal iştirakına görə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev cənablarının mart 2017-ci il tarixli sərəncamı ilə *Tərəqqi* medal? il? t?ltif olunmusdur.

2019-cu ildə *Azərbaycan Xalq Cumhuriyyətinin 100 illiyi* münasibətilə Korporativ Sosial Məsuliyyətdə təşəbbüs sahəsində fərqləndiyinə görə Azərbaycanda Qadın Sahibkarlığının İnkişaf Assosiasiyasının fəxri diplomuna, 2019-cu ildə Sosial Media Mərkəzi tərəfindən milli-mənəvi dəyərləin qorunmasındakı xidmətlərinə görə *Xəzər* milli mükafatına layiq görülmüşdür.

2020-ci ildə 1941-1945-ci il Böyük Vətən Müharibəsində qələbənin 75 illiyi münasibətilə Rusiya Federasiyasının və 2023-cü ildə isə Respublika Veteranlar Təşkilatının Həzi Aslanov yubiley medalı ilə təltif olunmuşdur.

2023-cü ildə vətəndaş cəmiyyətinin inkişafında əvəzsiz xidmətlərinə görə *Dövlət və Qanun* qəzetinin fəxri diplomuna, 2023-cü ildə Türkiyə Cumhuriyyəti 15 Temmuz Demokrasi və Milli Birlik günü münasibətilə keçirilən tədbirə verdiyi dəstəyə görə *Demokratik Cəmiyyət və Qadın hüquqlarının Müdafiəsi* İctimai Birliyinin Fəxri Fərmanı ilə təltif olunmuşdur.

2005-ci ildə *Təhsil* nəşriyyatı tərəfindən *Ömrün son baharı* adlı ilk kitabı, 2006-cı ildə həmin nəşriyyat tərəfindən *Sənsiz səninlə* adlı ikinci kitabı, 2008-ci ildə *Son ümidim* adlı üçüncü kitabı, 2010-cu ildə *Naksiana* nəşriyyatı tərəfindən *Tale yazısı* adlı dördüncü kitabı, 2011-ci ildə *Sabah* nəşriyyati tərəfindən *Nicat günü* adlı beşinci kitabı çapdan çıxmışdır.

*İlin kitabı* nominasiyasının anket sorğularının nəticələrinə görə Z.R.Quliyevanın müəllifi olduğu *Ömrün son baharı* kitabı Simurq Milli Mükafat Fondunun 2006-cı il *Baharın uğur çələngi* müsabiqəsi laureatının ali dərəcəli diplomuna layiq görülmüşdür.

Z.Quliyeva ictimaiyyət arasında böyük nüfuza, yüksək mədəniyyətə, geniş dünyagörüşünə, özünəməxsus düşüncə tərzinə layiq bir kadr kimi dərin hörmət qazanmışdır. İnsanlarla ünsiyyətdə nəzakətli, təvazökar, işinə qarşı məsuliyyətli, tələbkar, siyasi cəhətdən savadlı olan Zərifə xanım Quliyeva öz fəaliyyətində daima insanlarla ünsiyyətdə nəzakətli , təvazökar, işinə qarşı məsuliyyətli, tələbkar olmağa çalışmışdır.

Dövlətçiliyimizə xidmət etməklə, ümummilli lider Heydər Əliyev siyasətinin təbliğatçısı kimi müxtəlif qəzet və jurnallarda (*Respublika*, *Xalq*, *İki sahil, *Bütöv Azərbaycan*, *Respublika gəncləri* qəzetləri, *Zəriflik*, *Qoşa ulduz*, *Zəka və Ülviyyət*, *Gənclik news* jurnallarında)

aktual məqalələri ilə mütəmadi olaraq çıxış edərək, ulu öndərimizin davamçısı, möhtərəm Prezidentimiz İlham Əliyevin respublikamızda apardığı quruculuq və abadlıq işlərindən, həmçinin respublikamızın birinci vitse-prezidenti, ölkəmizin birinci xanımı, Heydər Əliyev Fondunun Prezidenti, YUNESKO və İSESKO-nun xoşməramlı səfiri, Mehriban xanım Əliyevanın istər milli-mənəvi irsin qorunması və dünya miqyasında təbliği, istər elm və təhsilin səviyyəsinin yüksəldilməsi, istərsə də səhiyyənin inkişafı, insanların fiziki-mənəvi sağlamlığının təminatı yönümündə həyata keçirdiyi strateji layihələr haqda daima ictimai marifləndirmə seminarları təşkil edir.

**Atası** - Quliyev Rzaqulu Hüseyn oğlu 1915-ci ildə Ermənistan Respublikasının Sisyan rayonunda anadan olmuşdur. O, 1939-cu ildən 1979-cu ilədək Azərbaycan Respublikasının Milli Təhlükəsizlik orqanlarında çalışmış, 1979-cu ildən 1982-ci ilədək Turizm idarəsinin rəhbəri işləmiş, 1982-ci ilin aprel ayında ürək-damar çatışmamazlığından vəfat etmiş, Birinci Fəxri Xiyabanda dəfn edilmisdir.

**Anası** - Quliyeva Zərri İbrahim qızı 1924-cü ildə Naxçıvan Muxtar Respublikasının Naxçıvan şəhərində anadan olmuş, 2009-cu ildə vəfat etmişdir.

**Qardaşı** - Quliyev Hüseyn Rzaqulu oğlu 1946-cı ildə Naxçıvan şəhərində anadan olmuşdur. O, uzun illər Milli Təhlükəsizlik orqanlarında işləmiş, hazırda Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə Özbəkistan Respublikasında Azərbaycan Respublikasının fövqəladə və səlahiyyətli səfiri vəzifəsində çalışır.

**Bacısı** - Quliyeva Aidə Rzaqulu qızı 1957-ci ildə Naxçıvan Muxtar Respublikasının Ordubad şəhərində anadan olmuşdur. 2019-cu ilin oktyabr ayında vəfat etmişdir.

**Oğlu** - Quliyev Orxan 1974-cü ildə Bakı şəhərində anadan olmuş, dövlət qulluğu orqanlarında çalışmış, 2004-cü ildə qəflətən beyinə qan sızması nəticəsində vəfat etmişdir.

**Nəvəsi** - Quliyev Ayxan ABŞ-da təhsil alır.

**Həyat yoldaşı** - Xəlilov Arzu Aydın oğlu uzun illər dövlət qulluğu orqanlarında çalışmış, son iş yeri Azərbaycan Respublikası Dövlət Gömrük Komitəsinin sədr müavini vəzifəsində çalışmış, 2008-ci ildə ürək qan damar çatışmamazlığından vəfat etmişdir.

## MÜNDƏRİCAT

